

**TürkSOY kitabxanası seriyası: 9**

AMEA Folklor İnstitutu Elmi Şurasının qərarı ilə çap olunur

Azərbaycancaya uyğunlaşdıran
və ön sözün müəllifi:
**Ramiz ƏSKƏR**

Redaktoru:
**Prof. Dr. Rafael HÜSEYNOV**

Sponsoru**:**
**Dr. Ayla ƏSKƏR (İzmir, Türkiyə)**

Naşiri:
**Dos. Dr. Rafiq BABAYEV**

**Sultan Hüseyn Bayqara. Divan. Bakı, MBM, 2011, 248 s.**

Kitabda böyük türk hökmdarı və dövlət xadimi, ümumtürk ədəbiyyatının görkəmli nümayəndəsi Sultan Hüseyn Bayqaranın divanına daxil olan qəzəl, təxmis, müxəmməs, rübai və qitələri toplanmış, “Risalə” adlı əsəri verilmişdir. Kitab 31 mart - 4 aprel 2009-cu ildə İstanbulda TürkSOY tərəfindən təşkil olunan «Türk Ləhcələri Arasında Uyğunlaşdırma Çalışmalarının Bugünkü Durumu və Qarşılaşılan Problemlər» mövzusunda Beynəlxalq simpoziumun tövsiyələrinə və yekun bəyannaməsinə uyğun olaraq nəşr edilir.

**İSBN: 978-9952-29-043-4**

# QILINC VƏ QƏLƏM SULTANI HÜSEYN BAYQARA

1405-ci ildə Əmir Teymurun vəfatı nəticəsində nəhəng bir imperiya dağılır. Teymurun övladlarına miras olaraq Mavəraünnəhrlə Xorasan çatır. Bu yerlərdə şahzadələr arasında şiddətli mübarizə, taxt qovğaları başlayır. Nəhayət, Şahrux 1409-cu ildə taxta çıxmağa nail olur. O, Xorasanı özünə alaraq, Mavəraünnəhri oğlu Uluğbəyə verir.

1447-ci ilin martında Şahruxun vəfat etməsilə hakimiyyət Uluğbəyin əlinə keçir. Elm sahəsində bəşəriyyətin ən böyük zəkalarından biri olan Uluğbəy dövlətin bütövülüyünü qoruya bilmir və 1449-cu ildə öz oğlu Əbdüllətif tərəfindən vəhşicəsinə qətlə yetirilir. Lakin ata qatili özü də yarım il sonra öldürülür və onların paytaxtı Səmərqənd 1451-ci ildə Miranşahın nəvəsi Sultan Əbu Səidin əlinə keçir.

Həmin dövrdə teymurilərin ikinci paytaxtı olan Heratda Baysunqurun oğlu Sultan Məhəmməd hökmranlıq edir. Lakin o da taleyin məşum cilvəsi ilə yenə 1451-ci ildə qardaşı Əbülqasım Babur tərəfindən öldürülür. Babur 1452-ci ildə Herat taxtına hakim olur. Tam bu sırada türk tarixi səhnəsinə Hüseyn Bayqara adlı yeni bir siyasi fiqur çıxır. Bu, əlinizdəki kitabın müəllifi Sultan Hüseyn Bayqaradır.

Ləqəbi Əbülqazi, tam adı Hüseyn bin Qiyasəddin Mənsur bin Bayqara olan Hüseyn Bayqara 1438-ci ildə Herat şəhərində dünyaya gəlmişdir. Valideynləri tərəfdən Əmir Teymur və Çingiz xan soyuna mənsub olan Hüseyn Bayqaranın atası Qiyasəddin Mənsur beşinci nəsildən Əmir Teymurun nəvəsi, anası Firuzə bəyim isə Sultan Hüseynin qızı, Miranşahın nəvəsidir. Hüseyn Bayqara 7 yaşına çatanda atası vəfat edir və o, 14 yaşına qədər Heratda anasının yanında qalaraq buradakı məşhur Dövlətabad sarayında yaxşı təhsil və tərbiyə alır. Sonra anasının məsləhəti ilə Əbülqasım Baburun sarayında xidmətə başlayır.

Əbülqasım Baburla Sultan Əbusəid arasında münasibətlərin qərginliyi üzündən Hüseyn Bayqara saraydakı işini buraxaraq 1454-cü ildə Səmərqəndə Əbu Səidin yanına gəlir, lakin burada bir sui-qəsdə qarışdığı şübhəsi ilə zindana salınır. Firuzə bəyim Səmərqəndə gələrək oğlunu zindandan xilas edir. Hüseyn Bayqara bu dəfə Mərvə gedib Əbu Səidin düşməni Muizəddin Səncərin qulluğuna girir. Muizəddin Səncər onun bacarıq və qabiliyyətini yüksək qiymətləndirir, hətta qızı Bikə sultanı ona verir.

Zəhirəddin Məhəmməd Babur öz “Baburnamə”sində Hüseyn Bayqaranı belə təsvir edir: “Çəkik gözlü və aslan boylu bir adamdı, belindən aşağısı incə idi... Xoşrəngli qırmızı və yaşıl ipək paltar, qara quzu

dərisindən börk və ya kalpak geyərdi. Bəzən bayramlarda kiçik, sarığını yamyastı və səliqəsiz şəkildə üç dəfə dolayaraq vağ lələyi taxıb namaza gedərdi... Məfasil xəstəliyi üzündən namaz qılmaz, oruc da tutmazdı... Şücaətli və cəsur bir adam idi... Teymur bəy nəslindən Sultan Hüseyn Mirzə qədər qılınc çalan heç kim məlum deyildir".[1]

1457-ci ildə Əbülqasım Babur vəfat edir. Hüseyn Bayqara bir teymuri şahzadəsi kimi Xorasan taxtına çıxır. Ancaq Herat hökmdarı Əbu Səid 5 il əvvəl onun yanında xidmətə başlayan bir gəncin qısa müddət ərzində taxt-tac sahibi olmasını qəbul edə bilmir, onun üzərinə ordu göndərir. Hüseyn Bayqara bu ordunu, sonra Səid ibn Türkmənin, daha sonra isə 1461-ci ildə Mahmud Mirzənin ordularını yenərək Astarabad əyalətini hakimiyyəti altına alır, 1464-cü ildə Xorasanı bütünlüklə ələ keçirir. Əbu Səid Mirzənin 1468-ci ildə Qarabağ yaxınlarında Ağqoyunlu hökmdarı Uzun Həsənlə savaşda məğlubiyyəti və qısa bir müddət sonra ölməsi nəticəsində 1469-cu ilin martında Herat taxtına çıxır. Ancaq az keçmədən Əbu Səidin oğlu Məhəmməd Mirzə Heratı ondan geri alır. Hüseyn Bayqara bu dəfə 800 nəfərlik seçmə bir dəstə ilə gecə qəfildən Herata basqın edir. Məhəmməd Mirzənin sarayı ələ keçirilir, özü isə öldürülür. Həmin il Xarəzmi də öz hakimiyyəti altına alan Sultan Hüseyn Bayraqa Mavəraünnəhrin, Xorasanın və Heratın yeganə hakimi olur. Beləliklə, onun torpaqları şərqdə Bəlx, qərbdə Bistam və Damğan, şimalda Xarəzm, cənubda Qəndəhar və Sistan ətrafına qədər uzanır. Hüseyn Bayqara bu böyük ölkədə 40 ilə yaxın səltənət sürür.

Zəhirəddin Məhəmməd Baburun "Baburnamə" əsərində verdiyi məlumata görə, Hüseyn Bayqaranın 14 oğlu, 11 qızı olmuşdur. Bəlx valisi olan böyük oğlu Bədiüzzaman Mirzə 1490-cı ildə atasına qarşı üsyan edir. Hüseyn Bayqara bu üsyanı yatırsa da, ata-oğul arasındakı gərginlik uzun illər sürür. Digər oğulları Əbülmöhsün və Müzəffər Hüseyn də bir neçə dəfə ona qarşı üsyan edirlər. 1500-cü ildən sonra Türküstana hakim olan özbəklər Şeybani xanın başçılığı altında Xarəzm dolaylarında Ceyhunu aşaraq Herat üzərində hücumlar edirlər. Hüseyn Bayqara 1506-cı ildə güclü bir ordu ilə onlara qarşı səfərə çıxır, yürüş zamanı Baba-İlahi adlı yerə çatmamış may ayının 4-də 68 yaşında ikən ölür və hələ sağlığında özü üçün bir mədrəsənin həyətində inşa etdirdiyi Qübbeyi-aliyyə türbəsində dəfn olunur[2].

Ulu Əmir Teymur soyunun son böyük hükmdarlarından biri olan Hüseyn Bayqara tarixə qılıncı qələmindən kəskin, qələmi qılıncından iti bir

---

[1] Baburname. Ankara, 1985, s. 252-253. (Rəşid Rəhməti Aratın tərcüməsi).
[2] Бабур-наме. Ташкент, 1958, стр 212. (Mixail Salyenin tərcüməsi).

sultan kimi daxil olmuşdur. O, hakimiyyətə gəldiyi ilk gündən ölkəsinin abad və rifah içində olmasına çalışmış, çoxlu körpü, karvansara, kitabxana, mədrəsə tikdirmiş, yol və kanallar çəkdirmişdir. Xondəmirin «Məkarim ül -əxlaq» əsərinə istinadən verilən məlumata görə, Bayqara viran olmuş Xarəzmi yenidən bərpa etmək və dirçəltmək üçün oraya Xorasandan 3 min adamı köçürmək barədə fərman vermişdir[1].

Hüseyn Bayqaranın dövründə ölkədə maarif-məktəb işləri də tərəqqi etmişdir. Yalnız Heratda 12 min tələbənin oxuduğu barədə məlumatlar vardır. Bu münvalla Herat ən böyük elm-mədəniyyət mərkəzinə çevrilmiş, Səmərqəndi kölgədə buraxmışdır[2].

Hüseyn Bayqara türk mədəniyyətinin parlaq bir səviyyəyə çatmasında mühüm rol oynamıştır. Heratdakı sarayını canlı bir elm mərkəzi halına gətirmiş, dövrünün adlı-sanlı alimlərinə və sənətkarlarına himayədarlıq etmişdir. Heratı alan kimi uşaqlıq dostu və məktəb yoldaşı Əlişir Nəvaini Səmərqənddən öz yanına çağıran Hüseyn Bayqara onu özünə vəzir təyin etmək istəmiş, bir çox mənbələrin verdiyi məlumatın tərsinə olaraq, Nəvai bunu qəbul etməmişdir. Çünki qürurlu bir insan idi və o dövrün törəsinə, yəni rəsmi dövlət protokoluna görə vəzir olsa dəxi mənşəcə özündən daha üstün əşirət rəislərinin arxasında dayanması lazım gəldiyini bilirdi. Nəvai sadəcə olaraq Sultan Hüseyn Bayqaranın dostu və müsahibi oldu. Ancaq o qədər etibarlı və nüfuzlu bir adam idi ki, sultan səfərə çıxanda Heratı onun buyruğuna verirdi.

Ümumən, bütün türk hökmdarlarına xas olan bir cəhət, yəni elmi-sənəti, alimi-sənətkarı himayə etmək Sultan Hüseyn Bayqaraya da aiddi. Vaxtilə Sultan Mahmud Qəznəvi Unsurini və Firdövsini himayə etmişdi. Firdövsiyə "Şahnamə"ni yazmağı sifariş etmiş, şair isə nankorluq göstərərək türklər əleyhinə bir əsər yazmışdır. Sultan Səncərin sarayında Ənvəri və Müəzzin, Atsızın sarayında Vətvat qorunduğu kimi, Hüseyn Bayqaranyn sarayında da şairlərdən Əbdürəhman Cami, Nəvai, Hilali, Abdulla Hatifi, Şeyxim Sühüyli, Hüseynəli Tüfeyli Cəlayiri, Asəfi, Bənnai, Seyfi Buxari, Mir Hüseyn Müəmmai, Molla Məhəmməd Bədəxşi, Yusif Bədii, Məhəmməd Salih, Ətai, Lütfi, Gədai və başqaları üçün hər cür şərait yaradılmışdı. Bayqaranın dəvətilə dahi miniatür ustası, Kəmaləddin Behzad, ünlü rəssam Şah Müzəffər, xəttat Məhşədi Sultanəli, "Təzkirətüş-şüəra"nın müəllifi Dövlətşah Səmərqəndi, baba-nəvə tarixçilər Mirxond və

[1] Навоий ва адабий таъсир масалалари. Ташкент, 1968, бет 109.
[2] Хайитметов А. Навоий дахоси. – Тошкент, 1970, 133-141 сах.

Xondəmir, alimlərdən Seyfəddin Əhməd, Mövlana Şeyx Hüseyn, Mollazadə, Mir Mürtaz, Molla Məsud Şirvani, Mir Ətaullah Məşhədi, Qazi İxtiyar, Mir Məhəmməd Yusif, musiqiçilərdən Xoca Abdulla Mərvərid, Qulməhəmməd Udi, Hüseyn Udi, Şeyxi Neyi, Şahqulu Qicaki, Qulam Şadi kimi neçə-neçə elm-sənət xadimi Heratdaki Dövlətxanada çalışaraq bu müəssisəyə o dövrün Elmlər Akademiyası özəlliyi verən insanlar olmuşlar. Burada fəaliyyət göstərən astronomlar Mövlana Məhəmməd Alim, Mövlana Kövkəbi, Xoca Övhəd Müstövfi, kimyaçılar Xoca Əbülvəfa Xarəzmi, Əbdülqəhhar, təbiblər Mövlana Həkim, Mir İslam Qəzali kimi alimlərin şöhrəti ətraf ölkələrə yayılmışdır. Bu barədə Zəhirəddin Məhəmməd Babur özünün "Baburnamə" adlı əsərində geniş məlumat vermişdir[1]. Hüseyn Bayqara bir hökmdar-mesenat olaraq bu adamların iştirakı ilə tez-tez məclislər təşkil etmiş, elmin-sənətin müxtəlif məsələləri barədə diskussiyalar keçirmiş, fikir mübadiləsi aparmışdır. Bayqaranın öz "Risalə"sində bu barədə belə yazır: "Hazır həm heç yerdə onlar tək kişi görünən deyildir. Heratda (Allahtəala onu afətlərdən qorusun!) və onun ətrafında könlə gəlişinə görə, şöylə də sözləri doğru və xəbərli kişilərin arzumuza yetirişlərinə görə, işləri – məna dürlərini düzüm çızığına çəkmək və diqqət gövhərlərinə vəzn libasının zinət və bəzəyini verən təxminən minə yaxın kişi var. Heç bir dövrdə elin minindən onu və heç vaxt yüzündən biri bunlar tək olmamışdır». Demək, Bayqara min nəfər alimi, sənətkarı himayə etmiş, onların yaşaması və yaratması üçün qayğı göstərmişdir.

Sultan Hüseyn Bayqara hələ sağlığında bütün türk və islam saraylarında bir hökmdar-şair və elm-sənət hamisi kimi tanınmışdır. Səfəvi və Osmanlı saraylarında şahlar və sultanlar ona rəğbət bəsləmişlər. Osmanlı və səfəvi təzkirələrində ona yer verilməsi də bununla bağlıdır. "II Bəyazid dönəmində Herat və Təbriz başda olmaqla İran və Orta Asiyadakı bütün kültür mərkəzləri ilə münasibətlər davam etmişdir. II Bəyazid ilə Hüseyn Bayqaranın məktublaşdıqları bilinir. Herat şəhəri Bayqara dönəmində (1469-1506) şeir, musiqi hüsn-xətt, naxış və cildçilik kimi sənət sahələrində ayrı bir üslubun məkrəzi olmuşdur. Onun mühitində yaşayan alim və sənətkarların əldə etdikləri yüksəliş digər kültür və sənət mərkəzlərindəki sənətçilərin həsəd aparacağı bir səviyyəyə çatmışdır. Hüseyn Bayqaranın ələlxüsus Molla Cami (1414-1492) və Əlişir Nəvai (1441-1501) ilə qurduğu münasibət Osmanlı şairləri tərəfindən idarəçi-sənətkar münasibətinin gözəl bir

---

[1] Бобурнома. Тошкент, 1989, бет 160-165. (Nəşrə hazırlayan: Pərsə Şəmsiyev).

modeli kimi qəbul və təqdim edilmişdir”[1]. Osmanlı şairlərindən Behişti gənc yaşlarından II Bəyazidin xidmətinə girmiş, işlədiyi bir qüsurdan dolayı qorxusundan İstanbulu tərk edərək Hüseyn Bayqaraya sığınmış, bir müddət Heratda yaşamışdır. Daha sonra Bayqaranın, Nəvainin və Caminin məktubu sayəsində bağışlanaraq II Bəyazidin sarayına dönmüşdür[2].

Təbii ki, Bayqaranın sarayında ən çox şeir məclisləri keçirilmişdir. Hüseyni ləqəbilə gözəl şeirlər yazan sultan hələ öz sağlığında divan tərtib etmişdir. Əlişir Nəvai özünün «Məcalis-ən nəfais» adlı təzkirəsində belə yazır: «Ol həzrətin xub əşarı və mərğub əbyatı beqayət çoxdur və divan həm mürəttəb olubdur. Divan ibtidasından bünyad qılındı və hər qəzəldən bir mətlə yazıldı» [3]. Ümumən, Nəvainin «Məcalis ən-nəfais» təzkirəsi səkkiz bölmədən-məclisdən ibarət olub, onun səkkizinci bölməsi bütünlüklə Bayqaraya həsr olunmuşdur. Nəvai bu bölmədə Hüseyn Bayqaranın divanındakı 164 qəzəlin mətlələrini, yəni ilk beytlərini yerləşdirmişdir.

Hüseyn Bayqara da Əlişir Nəvai haqqında son dərəcə yüksək fikirdə olmuş, onun haqqında belə yazmışdır: “Yenə məsnəvi üsulunda deyil, bəlkəm ərəb süxənvərlərinin və əcəm bədii sözlülərinin bəzək verən və divan edən hər dürli qoşqu görünüşlərinin əhlisinə bu həm qələm sürtüb, onlara həmlə urubdur. Onun bəyanı divanının fihristində – məzmununda bəyan ediləndir və yazılandır. Yox, divan deyil! Allah, Allah! Ol sapı-qatarı sözlərdən dolu gövhər olan cəngdir və pak mənalardan dolu ulduz olan fələk vərəqləridir.

*Demə divan, qəmü dərd əhlinə afət de onu,*
*Köyməkü şöleyi-qəm birlə qiyamət de onu.*

Hansı qoşqusu eşq əhlinin canına od urmaz, hansı məzmunu hicran qoşununun cismini köydürməz, bəlkə külüni göyə sovurmaz?! Hansı misrası fəraq ciyər xununun bağır qanını damdırmaz, hansı sözü hicran biçarəsinin göz yaşı seli ilə səbr-qənaət qoşununu axdırmaz?! Nəzm-qoşqu iqlimində hansı gürganə-qala köç gətirəndə özünə qarşı eşik açılmadı?! Hansı ulu yurda qəlb-şeir qoşunu ilə çapovulluq edəndə onu basıb almadı?! Bu gün nəzm-qoşqu sütunlarının yer üzündə qəhrəman odur».

---

[1] Türk ədəbiyyatı tarixi. Bakı, MBM, 2010, I cild, s. 22. (Nəşrə hazırlayan: Ramiz Əskər).
[2] Yenə orada, s. 67.
[3] Bet 209, 1941 علیشیر نوایی، مجالس النفایس، تاشکند

Maraqlıdır ki, Hüseyn Bayqara mükəmməl təhsil aldığı, Şərq poeziyası barədə dərin bilik sahibi olduğu halda əruzun yalnız rəməl bəhrinin müsəmmən formasından istifadə etmişdir. Bunu Zəhiərəddin Məhəmməd Babur da göstərir: "Şairliyi vardı. Bir divan da tərtib etmişdi. Şeirlərini türkcə söylərdi. Bəzi beytləri pis deyildir, ancaq divanı tamam bir vəzndədir"[1].

Sam Mirzə Səfəvi də «Töhfeyi-Sami» adlı təzkirəsində Bayqaranın yaradıcılığı haqqnda məlumat vermiş, onun türkcə iki, farsca bir neçə beytini misal gətirmişdir.[2]

Şairin divanı ilk dəfə 1926-cı ildə Bakıda «Hüseyn Bayqara divanı» adı ilə çapdan çıxmışdır. I türkoloji qurultaya ərməğan olaraq nəşr olunan bu kitab İsmayıl Hikmətlə Bəkir Çobanzadənin yazdıqları qısa giriş məqaləsi ilə açılır. Burada Hüseyn Bayqaranın 127 qəzəli və üç mürəbbəsi yerləşdirilmişdir. Məşhur türkoloq A.N.Samoyloviç kitabın çıxması barədə məlumat verərək onun bəzi çatışmazlıqları olduğunu göstərmişdir[3].

Sultan Hüseyn Bayqaranın bir neçə şeiri 1928-ci ildə Fitrət tərəfindən nəşr olunan «Özbək ədəbiyatı nümunələri»nə daxil edilmişdir. 1948-ci ildə çapdan buraxılan «Nəvainin zamandaşları» adlı kitabda da şairin bəzi şeirləri verilmişdir. 1968-ci ildə isə Bayqaranın əsərləri Daşkənddə nəşr edilmişdir[4].

Görkəmli şair-hökmdarın ən mükəmməl divanı 2005-ci ildə Aşqabadda nəşr edilmişdir. Türkmənistan Elmlər Akademiyası Milli Əlyazmalar İnstitutunun direktoru, tanınmış ədəbiyyatşünas, bir çox klassik türkmən şairinin əsərlərini, o cümlədən Hüseyn Bayqaranın divanını çapa hazırlayan Prof. Dr. Annaqurban Aşurov kitaba "Qəzəli qoşa qanadlı" adlı iri bir məqalə də yazmış, şairin dövrünü, mühitini, həyatını, yaradıcılıq xüsusiyyətlərini dərindən təhlil etmişdir.[5] Bizim kitab da həmin nəşr əsasında hazırlanmışdır.

Hüseyn Bayqaranın türkcə şeirləri Türkiyədə "Divan-ı Sultan Hüseyin Mirza Baykara" adıyla yayımlanmışdır. Şeirlerinin bir bölümü

---

[1] Бобурнома. Тошкент, 1989, бет 148.
[2] Soltan Hüseýin Baýgara. Divan. Aşqabat, 2005, 224 s. (Nəşrə hazırlayan: Annamurad Aşırov).
[3] Мир-Али-Шер. Ленинград, 1928, стр. 171-172.
[4] Хусайн Бойкаро. Девон Рисола. Тошкент, 1968. (Nəşrə hazırlayanlar: Ş.Qəniyeva, Ş.Abdullayeva).
[5] Soltan Hüseýin Baýgara. Divan. Aşqabat, 2005, 224 s.

isə “Hüseyn-i Baykara Divanı'ndan Seçmeler” adı altında basılmışdır. Prof. Dr. İsmayıl Hikmət Ertaylan şairin Amasya kitabxanasında tapdığı və həmin əlyazmanın İstanbul Universitetində aşkar etdiyi surətini 1945-ci ildə «Hüseyin Baykara'nın Risalesi» adı ilə çap etdirmişdir.[1]

Sultan Hüseyn Bayqara barəsində ən məzmunlu məqalələrdən birini ünlu Azərbaycan alimi Həmid Araslı qələmə almışdır. O, «Hüseyn Bayqaranın risaləsi haqqında» adlı məqaləsində risalənin yazılma tarixini dəqiqləşdirmiş, əsərdə Nəvainin «Xəmsə»si haqqında bilgiyə və Caminin həyatda olması haqqında məlumatlara əsaslanaraq risalənin 1485-1492-ci illər arasında yazıldığı qənaətinə gəlmiş, məqalənin axırında isə bu əsərin özbəkcə tərcüməsini vermişdir[2]. Biz bu risalənin yalnız son qismini kitaba daxil etdik. Ona görə ki, kiçik həcmli bu əsərdə əvvəlcə Allaha həmd-səna edilir, onun bütün varlıqları yoxdan xəlq etdiyi və insan oğlunun bunun üçün yaradana şükr etməsinin vacibliyi vurğulanır, daha sonra Allahın bəzi adamlara nə üçün çox, bəzilərinə az şey əta etdiyi barədə xeyli danışılır, bu işdə ilahi bir hikmət olduğu qənaətinə varılır. Axırda isə Əlişir Nəvai və Cami haqqında söz açılır ki, risalənin əsil canı buradadır, məhz həmin qism də kitabdadır.

Bayqaranın bu kitabına 200 qəzəli, Nəvainin iki şeirinə təxmisi, bir müxəmməsi, altı rübaisi və altı qitəsi daxildir. Şairin əsərlərinin sayı, göründüyü kimi, azdır. Lakin nəzərə almaq lazımdır ki, o, ilk gənclik dövründə, 16 yaşında xidmətə başlamış, 68 illik ömrünün 52 ilini fəal siyasətin içində olmuş, 38 il böyük bir dövləti idarə etmişdir. Saysız-hesabsız müharibələr, səfərlər, yürüşlər, rəqiblərinin və öz övladlarının yaratdığı problemlər, üsyanlar, idarəçilik işləri, məşvərətlər, qəbullar, məclislər onun vaxtını tamamilə almışdır. Əgər Hüseyn Bayqara sultan deyil, Heratda Dövlətxana sarayının bütün nemətlərindən istifadə edən qayğısız bir şair olsaydı, onun bədii irsi bundan dəfələrlə artıq olardı.

Şairin əsərlərinin dili xeyli sadə və xəlqidir. Təxminən beş əsr bundan əvvəl yazılmasına baxmayaraq bəzi kəlmələr istisna olmaqla asanlıqla anlaşılır, özündən hətta bir-iki əsr sonra Orta Asiyanın istər türkməncə, istərsə də çağatayca yazmış şairlərinin dilindən daha sadədir. Bu, bir yandan şairin fərdi üslübü, digər tərəfdən isə bir hökmdar və

---

[1] Yenə orada.

[2] Хамид Арасли. Хүсайн Бойкаро рисоласи хакида// Узбек тили ве адабиёти, 1966, №3, 6 бет.

sərkərdə kimi daim xalqın, qoşunun arasında olması ilə bağlıdır. Nəvai onun müxtəlif ləhcələrə dərindən vaqif olması faktını xüsusi vurğulayır. Əyanilik naminə, Bayqaranın "Burun" rədifli qəzəlinə baxaq. Burada müasir Azərbaycan oxucusu üçün arxaik olan iki söz (burun–əvvəl, ərməs–deyil), bizim klassik ədəbiyyatımızda da gen-bol işlənən və mənası geniş kütləyə məlum olmayan bir neçə ərəb-fars sözü vardır (xunab –qanlı su, yəni gözyaşı, fariq–arxayın, canafərin və afəriniş–hər ikisi: can bağışlayan, abi-heyvan–dirilik suyu, üşşaq–aşiqlər, bisaman–varı olmayan, kasıb, fəqir):

*Vəsl ara öldür məni hicran cəfasından burun,*
*Necə kim, qılsan xilas onun bəlasından burun.*

*Könlümə qəmdən burun xunab içirdi dərdi-eşq,*
*Xəstəyə şərbət içirən tək qəzasından burun.*

*Fariq ol, ey müddəi, məndən ki, görgəc yarı*
*Heç kamım yoxdur ölmək müddəasından burun.*

*Aşiq olmam mən bu gün, ey şeyx kim, canafərin,*
*Qismim etdi afəriniş ibtidasından burun.*

*Ey Məsiha, urma dəm kim, abi-heyvan zəhərdir,*
*Natəvan könlümə vəslinin ədasından burun.*

*Öylə yetdim cana hicrindən ki, gər tapsam visal,*
*Sormayam mən xəstə, hicran macərasından burun.*

*Ey Hüseyni, gər budur nalən eyb ərməs yara,*
*Gər yetər üşşaqi-bisaman nəvasından burun.*

Sultan Hüseyn Bayqaranın qəzəlləri mövzuca çox da əlvan deyil. Onlar janrın tələbi ilə, əsasən, eşq-məhəbbət mövzusundadır, ancaq bu eşq dünyəvidir. Burada sevən aşiqin ürək çırpıntıları, duyğuları, hicran oduna yanması, sevgilisinin gözəlliyi, nazı, qəmzəsi, fitnəsi, zülmü real şəkildə təsvir edilir. Məsələn, bu beytlərə göz yetirək:

Təbii ki, şair öz sevgilisini Əzra, Leyli və Şirinlə, özünü isə Vamiq, Fərhad və Məcnunla müqayisə edir. Şərq poeziyasında çox işlənən bu müqayisə Hüseyn Bayqarada bir sıra orijinal misralara bürünür:

*Eşqdən gəldi mənim başıma onca sə'b hal,*
*Kim onu Fərhad ilə Məcnun belə etməz xəyal...*

*Eşq zülmündən əgər Fərhadü Məcnun öldülər,*
*Məndə hər dəmdir ölüm, mən tək olar məzlum iməs...*

Eşq atəşi içində yanan şair Məcnunun ondan bir qığılcım aldığını və bu zaman əl-ayağını yandırdığını, Vamiqlə Fərhadın da hadisədən heyrətə düşdüklərini fəxrlə yazır:

*Eşqim odundan, gəlib Məcnun bir uçqun istədi,*
*Al dedim, sunğac əlin başdan ayağın örtədi.*

*Çün eşitdi Vamiqü Fərhad Məcnun köyməsin,*
*Gəlibən görgəc iki, heyrət oları çürkədi.*

Artıq bundan sonra Məcnuna dərs verməyin növbəsi çatır, şair özünün eşqdə daha üstün olduğunu vurğulayır, Məcnun eşqdə öz ustadını tanımalı, gerçək divanəliyi məhz ondan öyrənməlidir:

*Eşq ara Məcnunu derəm kim, özümə oxşadam,*
*Huşunu zail qılıb, divanəliyi örgədəm...*

*Eşq ara Məcnun Hüseyni birlə qılmaz bəhs kim,*
*Nə özü var onca, nə yarı onun yarınca var...*

Özünü eşqdə Məcnundan üstün görmək bütün divan şairlərində müşahidə olunur. Bunun ən gözəl örnəkləri Füzulidədir. Onlar çox məşhur olduğu üçün biz burada Məxdumquludan bir nümunə vermək istəyirik. Şair yazır:

*Eşqim vardır Məcnundan altmış kərə ziyada,*
*Qırx il qüvvətim vardır dərs deməyə Fərhada*[1].

Hüseyn Bayqarada yarın köyü, aşiqin bu köyə getməsi, ah-fəğan etməsi, köyün itləri ilə bağlı şikayətər çox qabarıqdır. Bizim ədəbiyyatşünaslıqda köy məsələsi bilərəkdən dolaşdırılmış, ədəbi dilimizdə olmayan bu söz *ku/kuy* şəklində verilmiş, yer-filan şəklində izah edilmişdir. Halbuki köy türkcə doğrudan doğruya kənd deməkdir, ancaq vaxtilə türk sözündən qorxulduğu üçün onu *kuy* kimi vermək daha münasib görülmüşdür. Bunu əruzun tələbi ilə sözün tərkibindəki vav

[1] Məxdumqulu Fəraqi. Seçilmiş əsərləri. Bakı, 2010, s. 390. (Nəşrə hazırlayan: Ramiz Əskər).

hərfinin uzadılması kimi izah etmək təşəbbüsünü bəlkə də qəbul etmək olar. O zaman mənası niyə doğru açıqlanmamışdır? Mən sanmıram ki, bizim alimlər sözün əsil mənasını biməmişlər. Bayqaradan misallar:

*Ey könül, ol bivəfa köyündə məskən eyləgil,*
*Zar ağla, şərh edib halımı şivən eyləgil...*

*Yar köyündən ötəndə görkəzər bu zar məks,*
*Söz desə dəxi cəvabında qılar bisyar məks...*

*İtlərinə tö'mə olar deb Hüseyni qoydu üz,*
*Ol sənəm köyünə üryan cismü əfgarı bilə...*

*Köyündə itlər onun kim, çıxdı hər yan müxtəlif,*
*Tilbə könlüm guya kim, onda oldu mütəkif.*

Bayqaranın qəzəllərinə dərin bir lirizm, axıcılıq və lətafət hakimdir. Bu üç keyfiyyət birləşincə və bütün qəzəl vahid bir mövzuya köklənincə, dadına doyum olmayan nümunələr meydana çıxır:

*Oda yandır sərvini ol qəddi-rə'na olmasa,*
*Yelə vergil gülü ol rüxsari-ziba olmasa.*

*Sərv birlə gül tamaşasına meylim yox dürur,*
*Bağ ara ol sərvi-gülruxdan tamaşa olmasa.*

*Niyə saplar çəkdi müjgandan, əgər can mülkünə*
*Gözlərinin meyli hər dəm qətlü yağma olmasa.*

Bəzi beytlərində qurduğu təzadlarla, işlətdiyi poetik fiqurların köməyi ilə Sultan Hüseyn Bayqara çox orijinal tapıntılara imza atır. Məsələn, canının alınacağı ilə hədələnən aşiq sevgilisinə deyir ki, onsuz da bu fəraqın cəbrindən onda can qalmamışdır:

*Dudi-hicrindən qaraldı beytül-həzanım mənim,*
*Seyli-əşkim birlə həm yumruldu viranım mənim.*

*Hər zaman qorxuzma kim, canını alam cəbr ilə,*
*Al, fəraqın cəbrindən qalar isə canım mənim.*

"Xəcil" rədifli qəzəldə şair cənnətin yar köyündən, lalə-reyhanın yar rəşkindən, divaneyi-üryan olan gerçək aşiqin huş əhli Məcnundan utanıb

xəcalət çəkdiyini bildirir. Bu qəzəldə dalğalanan və hər şeyi yıxan tufanın isə aşiqin seyli-sirişkindən utanaraq yenidən sakitləşib torpaq ara girdiyini görürük:

*Gülşən köyündən, ey can, rövzeyi-rizvan xəcil,*
*Üzü xəttin rəşkindən həm lalə, həm reyhan xəcil.*

*Övc gər tutdu, niyə girdi yenə topraq ara,*
*Olmayan olsa sirişkim bəhrindən tufan xəcil...*

*Eşq dəşti üzrə Məcnundan uyalsam, eybi yox,*
*Gah olur huş əhlindən divaneyi-üryan xəcil.*

Sultan Hüseyn Bayqaranın sənətkarlıq xüsusiyyətləri barədə çox danışmağa ehtiyac yoxdur. Oxucular özləri bu poeziyanın gözəlliklərini hər beytdə, hər qəzəldə açıq-aydın görəcəklər. Sultan Hüseyn Bayqara dastanlaşan bir şairdir. Xalq arasında ona Sultansöyün deyilir. Orta Asiyada, özəlliklə də Türkmənistanda onun həyatı, dahi şair Əlişir Nəvai ilə sarsılmaz dostluğu haqqında çoxlu rəvayətlər, dastanlar dolaşır. Bunların bir qismi ölkənin müxtəlif rayon və kəndlərindən toplanmışdır və hazırda Türkmənistan Elmlər Akademiyasının Milli Əlyazmalar İnstitutunun xəzinəsində qorunur. İnstitutun əməkdaşları bu materiallar əsasında «Mirəli», «Mirəli həm Sultansöyün», «Mirəli və Sultansöyün» adlı üç kitab nəşr etdirmişlər[1]. Bundan başqa, həmin mövzuda məşhur dastançı Qurd Yaqubun və onun şagirdi Həzrət Carıyevin ifasında "Gülfam" adlı bir dastan da lentə alınmışdır[2]. Bu əsərin ana sujet xətti təxminən bu məzmundadır: Əlişir gəncliyində Gül adlı bir qızı, qız da onu sevir. Sultansöyün təsadüfən həmin qızı görüb ona aşiq olur və Əlişiri elçiliyə göndərir. Qız dərddən ölür, iki dost da bundan ömür boyu xəcalət çəkirlər. Bu dastanda Sultan Hüseyn Bayqaranın divanında olmayan «Dadı, hey», «Sərv ağacı», «Ayrıldım», «Getdi», «Daş qaldı» kimi şeirlər yer alır. Məşhur şərqşünas A.A.Semyonov bir məqaləsində vaxtilə Daşkənd bazarından Mirxondun «Rövzət üs-səfa» əsərinin bir əlyazmasını satın alındığını, orada Mirəli ilə Sultan Hüseyn haqqında hekayələrin olduğunu yazır[3]. Buradan belə anlaşılır ki, bu iki

---

[1] Мыралы. Ашгабат, Түркмендөвлетнешир, 1948; Мыралы хем Солтансөйүн (дессан). Ашгабат, 1992; Мыралы ве Солтансөйүн (роваятлар). Ашгабат, 1994.

[2] Soltan Hüseýin Baýgara. Divan. Aşqabat, 2005

[3] Семенов А.А. Персидская Новелла о Мир-Али-Шире «Невои». Бюлетень, Средне-Азиатского Госуниверситета, Вып. 13, Ташкент, 1926, 177-185 стр.

böyük şəxsiyyət arasında dostluq barədə rəvayətlər bütün Orta Asiyada məşhur olmuşdur.

Yekun olaraq onu demək olar ki, şair-hökmdar Sultan Hüseyn Bayqara ortaq türk ədəbiyyatının ən nəhəng simalarından biridir. Onun bütün türk dünyasında, o cümlədən Azərbaycanda tanıdılması vacibdir. O, bir əlində qılınc, bir əlində qələm tutan türk hökmdarlarından Qazi Bürhanəddin, Cahan Şah Həqiqi, Şah İsmayıl Xətai, Sultan Səlim, Qanuni Sultan Süleyman, Şeybani xan, Zəhirəddin Məhəmməd Babur və başqaları ilə bir cərgədə dayanır. Bu bizim şanlı tariximizdir və onunla fəxr etməyə dəyər.

Təəssüf ki, bugünə qədər Sultan Hüseyn Bayqaranın Azərbaycanda heç bir əsəri, kitabı nəşr edilməmişdir. Bu sahədəki boşluğu aradan qaldırmaq üçün biz onun divanını nəşr etməyi qərara aldıq. İnanırıq ki, bu kitab oxucular və ədəbi ictimaiyyət tərəfindən rəğbətlə qarşılanacaq. Burada bir dostumuzun iradına da cavab vermək istərdim. O deyir ki, bu kitabları uyğunlaşdırmaq lazım deyil, onları orijinalda olduğu kimi vermək və hər naməlum sözü ulduz işarəsi ilə aşağı endirmək lazımdır. Biz də deyirik ki, biz bunların elmi-tənqidi mətnlərini hazırlamırıq, bunlar mətnşünaslara deyil, geniş oxucu kütləsinə ünvanlanan populyar nəşrlərdir. İstəyən hər kəs bu əsərlərin orijinalını internetdən endirə bilər.

Biz öz ənənəmizə sadiq qalaraq, bu kitabı da TürkSOY kitabxanası seriyası silsiləsindən nəşr edirik. Bununla da türk dünyasının UNESCO-su sayılan TürkSOY-un türk xalqlarının bir-birinə yaxınlaşması, ümumi inkişafı və qarşılıqlı zənginləşməsi uğrunda apardığı coşğun və nəcib fəaliyyətə kiçik bir töhfə verdiyimizə inanırıq.

Burada bir məsələni növbəti (doqquzuncu) dəfə vurğulamaq istəyirik: TürkSOY kitabxanası seriyası layihəsi bütünlüklə könüllülük əsasında həyata keçirilir. Layihədə iştirak edən hər kəs, o cümlədən bu kitabı tərtib edən, orijinalından ana dilimizə uyğunlaşdıran və ön sözün müəllifi bəndəniz Ramiz Əskər, redaktoru hörmətli Prof. Dr. Rafael Hüseynov bu işi türklüyə bir xidmət olsun deyə heç bir məvacib və honorar almadan təmənnasız yerinə yetirmişlər. Kitabın çapını İzmirdə həkim işləyən qızım Dr. Ayla Əskər maliyyələşdirmişdir. Min Bir Mahnı nəşriyyatının sahibi, əziz dostumuz Dos. Dr. Rafiq Babayev isə kitabı növbədənkənar nəşr etmişdir.

Əməyi keçən hər kəsə sonsuz sevgilərimlə,

**Ramiz ƏSKƏR.**
**Bakı, 21 dekabr 2010-cu il.**

# BİISMİLLAH-İR-RƏHMAN-İR-RƏHİM

## QƏZƏLLƏR

### 1

Ey həbibindən gəlib həmdində lauhsi səna,
Ol çü aciz olsa vəsfin, kim qıla, ala yenə.

Kami-rahatdır sənin şövqündəki ənduhi-qəm,
Eyşi-işrətdir sənin eşqindəki dərdü ina.

Gənc tapsa münim olmaz, kimi sən qılsan fəqir,
Gənc versə müflis olmaz, kimə sən versən qəna.

Könlümü et məmur mehrin birlə, leyk qoymagil
Nəfəs onda qılalı hirsi-həvəs tərxin bina.

Xəstə könlümü özündən, özgədən biganə qıl,
Özgədən biganə qılğac, qıl özünə aşina.

Zülməti-hicranın içrə yol azıb sərgəştəyəm,
Öz-özün sarı hidayət şəm'i birlə e'tina.

Lütf edib üşşaq ara, ya rəb, nəva qılgil nəsib,
Ta Hüseyninin məqamı olsa bu dari-fəna.

## 2

Məni-gəda, nedib ol şah həmdinə edim əda,
Ki şahlar şahı gəldi gədalarına gəda.

Cəlali-bağında [guya] xaşxaş hoqqası yalı,
Nücum dürləri birlə bu gümbəzi-mina.

Həvayi-qədərində yüz qatla zərrədən əskik,
Quyaş çırağı ki, aləmə yaydı nuri-ziya.

Gər olmasa onun əmri, fələk bu sürət ilə
Öz-özündən hərəkət öylə almaya əsla.

Böyükrək istəsə min ilçilik yol asandır,
Qaşında çərxdən olmaq, bu tudeyi-gəbra.

Təbarək Allah ol, sane' ki hikmətində,
Əzim cahil ərər, kim özünü der dana.

Hüseyni olsa sərasər günahi-cürm, nə qəm,
Çü dost lütfünün ümidi var, bəsdir ona.

**3**

Ey qılıb rövşən, ulus tapmağa ənvəri-xuda,
Müshəfi-rüxsar üzə vəş-şəms birlə vəz-züha.

Leylətül-merac şərhi sünbülün tabında dərc,
Ol şəbistan şəm'i-qəddin, onda arizdən ziya.

Gözlərinə taki çəkdi sürmə mazəal bəsər,
Bu müəyyəndir ki, bundan zahir oldu matəa.

Hər tərəf geysularındır şər üçün həblül-mətin,
Cəhlü zülmət çahından çəksən ərər əli rəva.

Gər sana yox sayə, tan ərməs, nədən kim, çün quyaş
Zahir oldu, sayə getmən, küncündə istər həfa.

Olmadın məktəbə mail, leyk azad eylədin
Əqli-hiss tiflin cəhalət məktəbindən daima.

Qılsan ahəngi şəfaət ol məqam içrə, nə qəm,
Gər Hüseyni dəxi uşşaqın ara tapar nəva.

**4**

Nə əcaib huy ərər, ey şuxi-siminbər, sana,
Kim neçə mehrinə can versəm iməs bavər sana.

Ya sana yox rəhm, ya peyğamım derkən səba
Qılmadı zahir mənim halımı, ey dilbər, sana.

Çünki divanənəm, almaram ətəyindən əli,
Gər cəfa yüz bunca olsa, ey pəri-peykər sana.

Ha cəbri-zülm qıl, ha vəfa kim, hər nəfəs,
Valehü divanərəkdir cani-qəmpərvər sana.

Həddən ötürmə Hüseynə cəfanı, rəhm qıl –
Kim, ulus şahı dürur, leykən ərər çakər sana.

**☙ 5 ❧**

Övrülüb gül başına bülbül visal olar ona,
Gül onun başına övrülsə nə hal olar ona.

Bülbülü kim görsə güldən bu sifəti-dilculuq,
Birə min qılmasa öz mehrin mühal olar ona.

Sənsizin dəm urmağım imkan iməs, bülbül ki ol,
Qalsa güldən ayrı, vah, nə qiylü qal olar ona.

Var idi çolpanü ayına ələm, vah, olmazın,
Kim qubar olar buna, yaxud zəval olar ona.

Bir quyaşdır Hüseyni eşqi, ümid ol durar,
Kim sənin hüsnün sipehrində kəmal olar ona.

**6**

Oldu gül vəqtiyü mən xar qəmindən mübtəla,
Hicr odundan lalə tək, bağrımda yüz daği-bəla.

Qan yaşımı gördünü gül tək könül halın dəxi,
Bu sifət halımı pəs alnında ərz et, ey səba.

Qərqəm mən göz mərdümi tək qan yaşım seylabına,
Ah kim, fəryadıma yetməz bu gün bir aşina.

Hali-zarın sən kimi sultandan ayrı düşəli,
Yapraq ərməs gülə kim, yüz dil bilə eylər əda.

Mən bilər ərdim ki, yoxdur intiha eşqimə heç,
Ta gül vəslin bilə qıldım məhəbbət ibtida.

Lalə tək mey camını tutgil qənimət gül çağı,
Xassə kim, işrətə çevirdi bülbülü bidil sala.

Gər Hüseyni tapmadı bərgi-cəmalın bağından,
Bu çəməndə ey güli-növrəs sana olsun bəqa.

**7**

Neyldən hər bir əlifdir ol mahi-rüxsar ara,
Ya nihalı sərvi olmuş cilvəgər gülzar ara.

Gər Məsiha ömründə diriltdi bir neçə ölü,
Dilbərim yüz min ölünü dirildər güftar ara.

Ey ki, olmuş hər səri-muyinə bağlı bir könül,
Yox əcəb, el könlünü oxşar isən rəftar ara.

Oxların içrə qılıncın zəxmindan qanlı könül
Açılıbdır guya ki, bir qönçə yüz min xar ara.

Anlamam, sərvi üzrə gül peyvənd qılmış bağban,
Yoxsa gül sancıbdır ol sərvi-rəvan dəstar ara.

Canı yüz dərdi-bəla içrə çidar mən görəli,
Leyk dözmərəm görməyə yarı əğyar ara.

Ey Hüseyni, çıxsa gülgün don bilə ol gül, nə qəm,
Gecə dan atınca ərdi dideyi-xunbar ara.

**8**

Vah ki, könlüm naləsi hər dəm pozulan can ara.
Guya ki, bir cüğt ərər, fəryad edər viran ara.

Hoqqayi-lə'lin arasında ərərmi dür dişin?
Ya ərər ol jalə kim, olar güli-xəndan ara.

Hər kişi görsə pərilər içrə sən göz mərdümin,
Bir pərini cilvə qılan, sığınar insan ara.

Onca qan tökdü gözüm hicrində, ey qan tökücü,
İndi göz açsam görərəm aləmi mən qan ara.

Sel gəlsə jalə birlə oxşadaram mən ona kim,
Gözlərimin ağı axan-dideyi-giryan ara.

İstəgəc məcruh könlümdən oxunu, rəşkdən
Tapmasın deb, yaşırıb mən sineyi-büryan ara.

İki qaşının xəyalı müttəsil könlümdədir,
Bir dilavər tək ki, salmış iki yay qurban ara.

Hicr girdabında qərq oldum, kəməndi-vəsl ilə
Çək məni kim, qalmayım bu bəhri-bipayan ara.

Gəldi eşqimə əlac etməyə bir gün bir rəfiq,
Bu Hüseyni köydü uşbu şö'leyi-suzan ara.

**9**

Sərvi-nazım cilvə qılmaz, vah, nədən bostan ara,
Ol əlif tək qaməti həm yox pozulan can ara.

Hər necə sərkəş durar bu sərvi-qədlər aqibət,
Mümkün ərməs bir bilə dəng olmağa bostan ara.

Hicr tabından içim büryan balıq tək örtənər,
Gər vətən tutsam balıq tək çeşmeyi-heyvan ara.

Vaiza, duzəx odu mühlik isə yüz şükür, kim
Bir üzü cənnət qəmindən qalmadıq hicran ara.

Bir bağır pərkaləsi hicrində, vah kim, qalmışam
Nuh ömrü çağlıq ahi-əşkdən tufan ara.

Ey müsəlmanlar, fəğan kim, Yusifimin hicrindən,
Qaldı hər bir qətrə bağrım parasından qan ara.

Mən qarrı yüz qəm bilə qalıb, igid canım varıb,
Sə’b mundağ kimsəyə düşməz, durar dövran ara.

Gər Hüseyni dərd ilə könlün pozar, ərməs əcəb,
Nəğmələr kim, dərd bilə zahir qılar əfğan ara.

## ☙ 10 ❧

Ta düşübdür mən sirişkim bəhrindən girdabda,
Zülfü tək sərgəştə cismim oldu piçü tapda.

Ta iki qaşın sarı mail durar suzan könül,
Öylədir kim, şüşeyü şəm’ asılar mehrabda.

Tərləyən məhvəş üzünün öylə lütfü var kim,
Görmədik ol xubluğu hərgiz güli-sirabda.

Lə’l ərər iki ləbin söz riştəsin ötürəli,
Süft ərər ağzın ki zahir oldu lə’li-nabda.

Zülfdən lə’lin sarı xalındır onun oğrusu,
Kim şəkər istər oğurluq eyləyə məhtabda.

Can verib əbnayi-dövr ondan vəfa göz tutma kim,
Yox dürur bu şivə nə məhbubü, nə əhbabda.

Ey Hüseyni, can verər düzgəc müğənni şəddi-ruh,
Ruhi-qüdsi feyz yaşırmış məgər mizrabda.

## ❧ 11 ☙

Oda yandır sərvini ol qəddi-rə’na olmasa,
Yelə vergil gülü ol rüxsari-ziba olmasa.

Sərv birlə gül tamaşasına meylim yox dürur,
Bağ ara ol sərvi-gülruxdan tamaşa olmasa.

Niyə saplar çəkdi müjgandan, əgər can mülkünə
Gözlərinin meyli hər dəm qətlü yağma olmasa.

Olmaya ərdi cünun dəştində sərgərdanlığım,
Zülfü piçü tabından başımda sevda olmasa.

Gövhəri-məqsud tapmaq mümkün ərməs, ey rəfiq,
Göz yaşın ta vəsl ümidi birlə dərya olmasa.

Saqiya, mey tut ki, hicr ənduhundan olmam xilas,
Hər dəm əlimdə ləbaləb cami-səhba olmasa.

Ey Hüseyni, badə içsəm yar əlindən dəng durar,
Olsa abi-Xızrü ömür cavidan, ya olmasa.

## ~ 12 ~

Firqətindən yox idi cismimdə can, canımda tab,
Gözdə xunab ərdiyü qəmgin könüldə piçü tab.

Nə dəmi-dərdi-qəmindən var idi arami-səbr,
Nə zamani-daği-hicrindən var ərdi xürdü xab.

Nagahan yetdi səvadi-namən, ol can müjdəsi,
Ol sifət kim, səfheyi-kafuru üzrə müşki-nab.

Oxuğac məzmununu cansız tənimə verdi ruh,
Eylə kim, İsa dəmindən ayəti-ümmül-kitab.

Budur ümidi Hüseyninin ki, yetər vəslinə,
Haq nəsib edər onu vallahü əlam bis-səvab.

### 13

Ey fəraqın zülmündən canımda od, könlümdə tab,
Oda düşən qıl kimi cismim ara həm piçü tab.

Eşq ara bitabi-taqət olmağım ərməs əcəb,
Kim fəraqın qoymadı könlümdə nə taqət, nə tab.

Harda varsa ol səadət əxtəri-həmrayi-mən,
Kim quyaş təcil qılsa, sayə həm eylər şitab.

Çün həvalə eylədin hicrana, qılma şikvə kim,
Qətl hökmü eyləyəndən sonra hacət yox itab.

Sərviyü sünbül bilə gül vəsfidir ol səfhədə,
Qəddü zülfü arizin yadı bilə açsam kitab.

Tutmayın hərgiz ol ay adını, leykin qəmzəsi
Qan tökənə meyl edib lə'li, mənim adım atıb.

Yar eşqindən Hüseyni könli-tabı nə əcəb,
Harda kim, od olsa ta olarmı olmaq onda tab.

## ☙ 14 ❧

Zərrə yanlığ eyb iməs, könlümdə düşsə iztirab,
Mehri-rüxsariyə çün hər ləhzə güzgüdür hicab.

Köynəyi gülgünmüdür, ya gül üzü əksi durar,
Ya quyaşın tabından gərdun üzrə qoymuş səhab.

Damsa bağrım qanı oxundan, çıxar könlümdən ah,
Dud olur çün qanını od üzrə damdırsa kəbab.

Rişteyi-canım üzülər zülfü sarı meyl edib,
Gərçi köprək qısalar hər necə tapsa riştə tab.

Sorsam, ey ömür, varanda şitabın nə idi,
Naz ilə der kim, əcəb yox, ömür işi olmaq şitab.

Saqiya, hicran xərab etmiş məni, doldur qədəh,
Çün xərab olmaq gərək, barı olaq məstü xərab.

Ey Hüseyni, öylə kim, vəsl oldu cənnət, dost huri,
Hicr həm duzəx durar şövq odundan onda əzab.

## ❧ 15 ☙

Bir müsafir ay xəyalı qıldı könlümü xərab,
Qalmadı canıma onsuz bir zaman taqət, nə tab.

Bir əcaib söz eşitgəc ol müsafirdən bu gün
Vardı könlüm ötrüyə, canıma düşdü iztirab.

Vəslində göz gahi ağlar, gah baxar rüxsarına,
Gah yağıb, gahi duran tək bahar olğacda səhab.

Vəsli-iqbalında çox azarda mən əğyarından,
Vah, nə taledir ki, çəkərəm behişt içrə əzab.

Pərdə tək ol üzə üz sürtənə xud yoxdur həddim,
Bəs üzüm sürtənə gər olsa müyəssər ol niqab.

Saqiya, bir lə’ligün ləb şövqündən aşüftəyəm,
Tut ləbaləb cami-yaqutuna salıb lə’li-nab.

Ey Hüseyni, yari-həmdəm qeyb olğac gec gələr,
Səhv imiş ol nöqtə kim, el ömr işin derlər «şitab».

## ❧ 16 ❧

Təlbirib itən könlü istədim hər yan varıb,
Kuhü dəryayü biyabanları bir-bir axtarıb.

Tapdım ərsə, oturubdur yüz qəmü ənduh ilə,
Yar zülfündən betərrək ruzigarın döndərib.

Vah ki, sorğac halını, yummaz, töküb didə sirişk,
Yeddi gərdundan fəğani-odlu ahın ötürüb.

Vamiqü Fərhadü Məcnun möhnətimə dözməyib,
Köydülər ahim odundan hər biri bir yan varıb.

Mən dəxi dözməm onun, istər vətən deb köyməyin,
Yüz tümən təklif ilə gətirdim onu yalvarıb.

Gətirib çak eyləyib köksümü saldım yerinə,
Firqətü köymək odundan, hamısından qurtarıb.

Ey Hüseyni, ol gəlib tutğac visali-cür’əsin,
Dindirib könlümü mən həm içdim onu sıxarıb.

## ❧ 17 ❧

Zə’fdən titrəyib, damına yıxılğac çırmanıb,
Ol çibin tək tovladı hər yan tənimi aylanıb.

Leyliyü Şirinü, Əzra vardılar, vah, nə əcəb,
Olmağım valeh sana kim, sən qalıb, sən saylanıb.

Vamiqü, Fərhadü, Məcnun eşq oduna dözməyib
Vardılar, mən qaldım olardan oduma çürkənib.

Çürkənib qalğac oduma, məxfi istər qeyridən
Oturub mən türfəyiş, gör kim, külümü bürkənib.

Hicrində canıma bidad eyləsəm eyb etməyin,
Kim qatı hal ərmiş ayrılmaq birinə örgənib.

Vah, nə taledir ki, qəm şamı düşümə girsə yar,
Bavər etməz uyğudan səyrib qoparam, diskinib,

Yar köyündən ötəndə başıma yağsa bəla,
Onda eylərəm təvəqqüf hər cəhətdən güymənib.

Rənci-hicran zə’findən təprənməyim imkan iməs,
Onca qüvvət harda kim, köyünə varsam sürünüb.

Ey Hüseyni, cüz fəna ahəngi mə’lum olmadı
Köyündə kim, növhə qıldın zə’f vəqti inrənib.

**18**

Eşq ara Məcnun kimi ölsəm qəmindən hayqırıb,
Daşıya qəbrim daşın Fərhad hara sındırıb.

Dərd ilə eşq əhlinin alnına gələ tirə gün,
Göyə sovursan külümü, zari-cismim yandırıb.

Saqiya, ömrü əbəd tapsın der ərsən camı
Ağzıma yetirgil, öz ağzına əvvəl yetirib.

Çün ötərsən nazi-istiğna bilə, bir xəm olar,
Lütf ilə baxsan ki, yolunda qalaram təlmürüb.

İt kimi qovunca köyündən mənə yetim deyib,
Razıraq mən itlərin alnına salsan öldürüb.

Bir güli-rə'na həvəsində ki, bimar olmuşam,
Qan yaşım rəngi sarı üzdə durubdur bildirib.

Gər Hüseyni könlü köyün içrə yetdi deməyin,
Kim onun könlün yesir etdi, gözün baxıb durub.

**❧ 19 ☙**

Ey dodağın şərbəti-şərməndəsi abi-həyat,
Nitqin alnında ərər, İsaya dəm urmaq uyat.

Ləblərin çün kim Məsiha tək ölü diriltdilər,
İnfiqalından qızardı lə’lü su oldu nəbat.

İltifatın, ey sənəm, dilxəstələrin qətlidir,
Necə olarsan məni-dilxəstəyə biiltifat?

Bu ki bidadın oxundan el qaçar can xofundan,
Barçasın cəm eylə, ey qatil, mənim canıma at.

Gər qulunam, cəbr çox qıldın dedim, saqın məni,
Demədim üşşaq ara rüsva qılıb aləmə sat.

Bu çəmən əhlinə, ey bülbül, müqəyyəd olma çox –
Kim, səbaya seyr yoxdur, daima gülə səbat.

Ey Hüseyni, necə olmaq binəva üşşaq ara,
Zöhd ahəngi qıl, özünü afiyət əhlinə qat.

**20**

Vah ki, hicran bərqindən, düşdü şəbistanıma od,
Uçqunu birlə tutuşdu beytül-əhzanıma od.

Ruzigarımımı eşq etdi qara, ya oldu dud,
Hicr çün qəm duzəxindən saldı viranıma od.

Eşq odunun şö'ləsindən köydü könlüm, ya məgər
Düşdü suzan ahından Məcnuni-üryanıma od.

Aləm əhli canını yandırdı yalan əhd ilə,
Bunca kim, verdi ikən ol əhdi-yalanıma od.

Badə təbindən məgər lə'lin olubdur atəşin,
Ya məgər mey ləm'əsi saldı mənim canıma od.

Dedim: oxun dəysə dərdim dağına od çaxılar,
Dedi: su yerinə vermiş çərx peykanıma od.

Gər Hüseyni ahından od düşsə hər yan, eyb iməs,
Eşq mundağ həmra etdi ahü əfğanıma od.

**21**

Alalı şeyda könlümü bir qəddi-rə'na igid,
Görmədim hüsn əhli içrə hüsnü ruhəfza igid.

Yox həlayiq kim, məlayik heylindən çıxar fəğan,
Səyridib at, girsə meydan içrə ol rə'na igid.

Naseha, neylim, özümü mey içəndən zəbt edim,
Kim mana mənzur saqidir, qədəhi-peyma igid.

Yox əcəb eşqində bir divanə mən tək olmasa,
Çünki sən tək yox pəri-peykər mələk sima igid.

Zümreyi-üşşaq ara yox mən kimi rüsva qarı,
Öylə kim, hüsn əhli içrə sən kimi ziba igid.

Gərçi hüsni-naz uyğusundan açılmaz gözün,
Bu qarı qul sarı həm bir baxgil, ey mirzə igid.

Binəvalıqdan, Hüseyni, çarə yox üşşaq ara,
Xassə kim, yar olsa məhz nazi-istiğna igid.

**22**

Könlüm aldı bir qəddi-rə'na, donu gülgün igid,
Hüsnü dilkeş, özü ziba çabükü mövzun igid.

İndi bitən sərv tək, hər sarı qəddi cilvəgər,
Yeni doğan məh yanlığ, hüsnü ruzəfzun igid.

Yüz tümən Xosrovü Şirin lə'linə Fərhad edib,
Biadət Leylini qılan eşqində Məcnun igid.

Yox ki mən tək arzusunda bəsi qəmgin qarı,
Bəlkə yüz min məncə dərdi-eşqində məhzun igid.

Yox ki salan fitnə dövrana müfəttin qəmzəsi,
İki fəttan göz bilə həm hüsnünə məftun igid.

Saqiya, bu kəhrüba tək üzə meydən genə ver,
Kim salar canım ara od bir ləbi meygun igid.

Ey Hüseyni, qarıyan olsan dəxi çək cəbrini,
Tərki-eşqi etsən andağ tapmağındır çün igid.

### ☙ 23 ❧

Olalı qaib gözümdən bir qəddi-mövzun igid,
Görmədim hüsn əhli içrə hüsnü ruzəfzun igid.

Gəlsə altın üz üzrə gülgün yaşım, vah nə əcəb,
Gözdən itmiş bir donu zərkeş, üzü gülgün igid.

Kim ikən meydan ara qaib igidlər gözündən,
Kim qəmindən daş urar köksünə yüz məhzun igid.

Mən qarı ölsəm qəmi-hicranında, yoxdur əcəb,
Kim ərər sərgəştə qəm dəştində yüz Məcnun igid.

Nedək, axşam gəlsə ay üzrə yaruq əxtər kimi,
Zib üçün başı üzrə dikən dürri-məknun igid.

Ol igid alnında bir əfşanlıq eylə nəqd can,
Arzu, ya sə'yı birlə olmağımdır çün igid.

Ey Hüseyni, olsa yüz canın fəda qıl hicrində,
Kim tapılmas dünyada andağ yenə mövzun igid.

## 24

Aldı bu məhzun könlümü bir qədəh peyma igid,
Qəddi rə’na, özü ziba, hüsnü bihəmta igid.

Afəriniş bəzminin arayişidir hüsn ilə,
Bizə olan zibü rə’nalıqda bəzmara igid.

Canü könlüm gülşəninin həm gülü, həm sərvidir,
Gül kimi yüz birlə geyən xəl’əti-həzra igid.

Cana yetə İsa ruhulla, ey arami-can,
Tapsa budur fənada sən kimi tərsa igid.

Əhli-eşq içrə tapılmaz mən kimi şeyda qarı,
Əhli-hüsn içrə necə kim, sən kimi ziba igid.

Ta xəttin çıxmaz dürur, qılgil vəfa xəttin rəqəm,
Kim bu gülşən gülləri olmaz tikansiz, a igid.

Demə, ol cövr etsə özgə bir igid peyda qılar,
Ey Hüseyni, olmaz ondağ çün yenə peyda igid.

**❧ 25 ❧**

Vəslindən məhrum olub, hicrindədir mən paybəst,
Nəşin çəkən dəvənin yolunda oldum yerə pəst.

Gah qəltandır yaşım, gah uyğuda bimar göz,
Yox əcəb, gər gözyaşım qəltanü ol uyğuda məst.

Kuhi-Qaf üzrə qəmi-hicrimi qoysam bir zaman,
Varmı imkanı onun kim, tapmaya ol dəm nəşəst.

Tünü gün məhzun könül, biz naləni pəst etməli,
Vah ki, müşkül hal ilə bizə qatı iş verdi dəst.

Özgə məhvəşlər xəyalı gəlsə naməhrəm görüb,
Könlüm ətrafını qıldım mehr yanlığ xarbəst.

Tan iməsdir kim, olub mən məsti tam şamı əbəd,
Kim əzəldə qismətim oldu mana canı ələst.

Ey Hüseyni, vəsl üçün hər necə kim çəkdim məsaf,
Hicr olğac rubəru qəlbim ara oldu şikəst.

**☙ 26 ❧**

Yar köyündən ötəndə görkəzər bu zar məks,
Söz desə dəxi cəvabında qılar bisyar məks.

Ol pəri nəzzarəsinə, ey ki, tapdın dəstrəs,
Gör mənim məcnunluğumu, qılmagil zinhar məks.

Ağıl durmaz məndəyü könlümdə bir dəm, ey rəfiq,
Öylə kim, əsrüklər içrə eyləməs huşyar məks.

Gər desəm, ey əxtəri-sə’d, ötməgil təcil ilə,
Der ki, öz seyrində qılmaz kövkəb səyyar məks.

Bəzmindən soranda gər gecrək çıxarma zə’fdən,
Eyb iməs qılsa təhərrük vəqtində bimar məks.

İştiyaqında ölüm halındadır mən, ey əcəl,
Can fəda eylər sana gəlincə qılsan yar məks.

Necə mən hicrində məks etməyim, leyk xoş dürur,
Ey Hüseyni, neçə gün ömr eyləsə izhar məks.

**☙ 27 ❧**

Töküb qanım, tərəhhüm qılmadın heç,
Görüb halım, təbəssüm qılmadın heç.

Təbəssüm qılmayıb canımı aldın,
Alıb canım, tərəhhüm qılmadın heç.

Cahan əhli köyüb ahımdan, ey yar,
Bu ahımdan təvəhhüm qılmadın heç.

Fəraqında könül çox çəkdi əfğan,
Visalında tərənnüm qılmadın heç.

Hüseyni hicrində əfğandan özgə,
Görüb möhnət, tənəüm qılmadın heç.

## ☙ 28 ❧

Xəstə canım zə’finə lə’li-şəkərbarın əlac,
Zari-könlüm dərdinə canbəxş güftarın əlac.

Şami-hicranın ara kim tirədir giryan gözüm,
Onu rövşən eyləməyə sübhi-rüxsarın əlac.

Kafiri-eşqin olub kim könlümə, nedək, cünun,
Əqli-din kəsbinə onun bəndi-zünnarın əlac.

Özgələr nuş ləbindən, xəstəyəm, leykin ərər
Nişi-qəmzəndən həzin könlümə azarın əlac.

Ey Məsiha, ta ləbi-canbəxşindən bir nöqtə var,
Xəstə canıma əcaib ərdi izharın əlac.

Ey könül, çox qılma əfğan, çün onun bidadına,
Qılmadı qəm külbəsində naleyi-zarın əlac.

Ey Hüseyni, xəstə canına ləbindən qüvvət ver,
Kim məgər tapa bu şərbət birlə bimarın əlac.

**29**

Yardan nə gəlsə, aşiq versə can ola mübah,
Dəftəri-eşq içrə guya böylə olmuş istilah.

Könlüm alğac barça el, könlün müsəhhər eylədin,
Mülklər fəthin bizim kişvərdən etdin iftitah.

Gözə derəm sürmə qılam mən ayaği-toprağın,
Ol ki göz açğac sənin üzünü görüm hər səbah.

Çıxsa könlümdən dəmadəm isti ah, ərməs əcəb,
Kim səmum olacaq odlu dağdan əsən riyah.

Naseha, indi səlah ərməs mana pəndin sənin,
Eşq ara rüsvalıq içrə qopdu çün məndən səlah.

Eyş bostanında ruhum tazə olmaq istəsən,
Tutgil, ey gülçöhrə saqi, dəmbədəm gülrəng rah.

Ey Hüseyni, ol quyaş sarı həva qılsan nə eyb?
Çünki saz etdin riyazət birlə hümmətdən cənah.

## ❧ 30 ❧

Ey üzün tək görməyib bir mehr dövranında çərx,
Bəlkə çox çəkib xəcalət mehr rəxşanında çərx.

Tünü gün, vəl-leyl, vəş-şəms ayətin vəsfin ara,
Nazil etsə yox əcəb zülfu üzün şanında çərx.

Çəkdilər Yusifi gər öz vəznincə altın ilə,
Onu hərgiz sonca tutmaz hüsn mizanında çərx.

Anca hüsnündən quyaşın infialı var kim,
Əsrəy almaz onu bir saət üzün yanında çərx.

Gündüz ola geceyi-xurşid, ay bir gün əgər
Ərzini cilvəgər qılsa öz eyvanında çərx.

Gər pəri hüsnün bilə dava qılar divanədir,
Onu hüsn əhlində tutmaz adəmi-sanında çərx.

Gər Hüseyni şami-hicranı uzundur, eybi yox,
Susadıb varmış özündən onun əfğanında çərx.

**31**

Müddəti-eşqin xəyalı birlə ərdim müstəmənd,
Badeyi-vəslin bilə bir dəm olam deb bəhrəmənd.

Çün bu dövlət olğu tək oldu müyəssər, vay kim,
Səhhətim ol ləhzə tale zə’findən tapdı gəzənd.

Haq bilər kim, can ara könlüm idi həmsöhbətin,
Gərçi mən zə’f əlindən hicrinə oldum paybənd.

Sormağım üçün ləbindən kim, yazıb ərdin hədis,
Dəf edər yəni könlünün zə’fini gül birlə qənd.

Lütf edib çəkgil Hüseynini kəməndi-vəsl ilə,
Ey ki, zülfün riştəsi can boynuna ərər kəmənd.

### 32

Qıldı ruhəfza ləbin gülmək bilə canımı əxz,
Ağladıb kafir gözün həm nəqdi-imanımı əxz.

Guya ki, aşüftə zülfün həm qılıb əyyarlıq,
Eylədi sevda ara hali-pərişanımı əxz.

Qıldı ağzının xəyalı həm adəm səhrasında,
Cövhəri-canımı, yəni nəqdi-pünhanımı əxz.

Lə’lindən hər kam kim, tapdım, unutdurdu fəraq,
Eylədi ömrümdə candan bəhrə alanımı əxz.

Çün məni-bidilə atdı qəmzəsindən navəki,
Dedi kim, qılğil könül yerinə peykanımı əxz.

Vah ki, dövrani-hamindən ağzıma etgəc qətreyi,
Saqiya, dövr eylə ol dəm bir qədəh qanımı əxz.

Əqlü huşü səbr varıb, qalanım bir can idi,
Ey Hüseyni, hicr eylər indi qalanımı əxz.

**33**

Şükrülillah kim, cəmalından gözüm rövşən durar,
Xəstə könlümə visalın gülbünü məskən durar.

Odlu ahımdan ki, hicrin içrə çəkdim şö'lələr,
Şəm'i-iqbalım bu gün ol şö'lədən rövşən durar.

Dürəfşan gözüm cəmalın cövhərinin əksindən
Gər əvvəl dürci-gövhər ərdi, bu gün məxzən durar.

Nə üçün gül tək açılmaz bəzmi-işrət içrə kim,
Məclisim şəm'i bu dəm ol sərvi-simintən durar.

Əşk ilə işrət gülün açdın yenə eşq əlindən,
Ey Hüseyni, sana yüz təhsinü min əhsən durar.

**❧ 34 ☙**

Tazə oldu, baği-könlümdə fəraq azarıdır,
Cilvə qıldı gül necə, bağrımda hicran xarıdır.

Sərviyü güldən hər dəm əfzun olsa dərdim, nə əcəb,
Dərdli könlüm çü ol həmdərd yarım sarıdır.

Vah, necə gülnar yanlığ lalələr nəzzarəsin,
Mən ki, bir gülrux üçün bağrımda hicran xarıdır.

Naseha, gül gəştindən könlüm əlacın alma kim,
Xəstə könlümə tikilən xari-hicran karıdır.

Çərx dikəndir, ayıraq, ey gülruxundan gül çağı,
Ey Hüseyni, bu fəraq ol vədənin olcarıdır.

### 35

Ah kim, bağrım fəraqi-dərd oxundan yaradır,
Vah ki, könlüm tiği-hicran zəxmindən yüz paradır.

Xəstə könlüm sormaq üçün bir nəfəs et, ey təbib,
Kim bu gün hər ləhzə bimarım özündən varadır.

Səbr öyünü, naseha, pəndin nə abad eyləyə?
Tilbə kim, əqli-daniş mülkündən avarədır.

Hər gecə bir ay qəmindən, vah ki, zalım çərxin
İşi əhvalıma yüz min göz bilə nəzzarədir.

Ey Hüseyni, köyməyimi eşq ara eyb etməyə,
Kim ki, bilər xəstə könlümdə nə atəşparədir.

**☙ 36 ❧**

Gül üzü ətrafında ol laleyi-əsfərmidir?
Yanında zülfümüdür, ya kakili-ənbərmidir?

Laleyi-əsfərmidir ol ay üzünün dövründə,
Ya qəmər dövründə görkəzən özün əxtərmidir?

Lə'lindənmi hər zaman zahir olar şirin sözü,
Yoxsa gül yaprağından olan əyan şəkərmidir?

Ariz üzrə hər tərəfmi göz açıb sən naz bilə,
Ya açılan hər sarı gülzar ara əbxərmidir?

Dəhr içində afəti düşmüş, qiyamət oldumu,
Ya ki, çıxan bəzmdən məst ol pəri-peykərmidir?

Lə'li-meydən cam tutub mən, saqiya, şərh eylə kim,
Badə qüvvəti ruhdur, ya özgəcə cövhərmidir?

Ey Hüseyni, barça üşşaq içrə sənsən binəva,
Halına nasazlıqlar qılan ol kafərmidir?

**❧ 37 ☙**

Elə baxıb hər zaman yüz naz bilə gülmək nədir?!
Özgələri dirildib, vah, məni öldürmək nədir?!

El sarı baxıb gülüb, qönçəni eylər dürəfşan,
Rəşk peykanın həzin könlüm ara tikmək nədir?!

Abi-heyvanından elə can bağışlar lütf ilə,
Lə'lin odundan mənim canımı köydürmək nədir?!

Nuşxənd eylər, çü çox sözlər qatarsan özgəyə,
Mən visalından tələffüz eyləgəc, söymək nədir?!

De yamanlafdır yiyəsinə «xəbər yox», ey könül,
Bu misil tək hər zaman ol şövqündən küsmək nədir?!

Elə lütf etməkdən gər canımı almaqdır qərəz,
Yar əgər sənsən mənim, can verməyimə şək nədir?!

Ey Hüseyni, çün mana köprək idi ümmidi-lütf,
Mana kəm olmaq nə ərdi, qeyriyə köprək nədir?!

**38**

Olsam öy küncündə, əşkim qətrəsi gülnar ərər,
Əzmi-gülzar eyləsəm, gül gözlərimə xar ərər.

Gündüz ol bu birlə hər növ' olsa qılaram bəsər,
Gecə viran öyündə, vah, yalnızlığım düşvar ərər.

Qılmaya mən' cünunam, eşq ara köyən kişi,
Kim məni divanə qılan bir pərirüxsar ərər.

Arzudur düşdə vəslin, vah ki, düş ərər mühal -
Mana kim, gözüm gecə dan atınca bidar ərər.

Ta Hüseyni visal üçün üzünə dikər gözlərin,
İynə tək hər kirpiyinə əşkdən bir tar ərər.

**39**

Firqətindən xəstə könlüm qətrə-qətrə qan ərər,
Allah, Allah, bu nə hicri-bihəddi-payan ərər.

Hər sarı üz zəxm ərər, cismimdə vah naseh dili,
Hicr oxundan hər cərahət içrə bir peykan ərər.

Göz qılar bu vəchdən tünlər dür əşkin nisar,
Kim xəyalın can öyündə hər gecə mehman ərər.

Xəncəri-cəbrin durar odlu könül asayişi,
Su necə kim, təşnə ləblər dərdinə dərman ərər.

Ey Hüseyni, hicr ara bixudluğum eyb etməyə,
Hər kişi kim, bir pəri eşqində sərgərdan ərər.

**40**

Zə'fdən hər dəm çü ol arami-canım susayar,
Canım olub xəstə, cismi-natəvanım susayar.

Zinhar, çevriləsən başına, ey sərgəştə can,
Hər haçan kim, görsən ol cani-cahanım susayar.

Görünər hər dəm qızıl təlxincə axan qan yaşım,
Qəm əlindən çünki ol sərvi-rəvanım susayar.

Mehribanlıqdan iməs, vallah, diri olmaq mana –
Dərddən, çün ol rəfiqi-mehribanım susayar.

Ey Hüseyni, süstlük olar əgər can verməsəm,
Zə'findən hər dəm çü ol arami-canım susayar.

## ❧ 41 ❧

Eylə kim xurşidi-tabi-zərrəni peyda qılar,
Qönçə ağzın sirrini həm gül üzün güva qılar.

Zib edər göy səbzəsi birlə quyaş rüxsarını,
Katibi-qüdrət ki, xəttin nüsxəsin inşa qılar.

Var ikən aşiqə möhnət oxların yağdıralı,
Ol ki müjganın qılıb navək, qaşını yay qılar.

İstədi canü könül nəqdini, vah, sud eylərəm,
Gər ləbindən busəni ol nəqd bilə sevda qılar.

Hicr zülmün gör ki, səbr eylə desəm, eylər həlak,
Eyləsəm bisəbrilik, aləm ara rüsva qılar.

Mənim əhvalım görüb, ibrət alın, ey əhli-eşq,
Kim ki, bir bədmehr eşqində özün şeyda qılar.

Ey Hüseyni, çün ol odlu çöhrədən alsam nəzər,
Gözlərimə dərdi-hicran şöləsindən od çaxılar.

**42**

Sayəvan zülfü kim, ol ay tək üzünə yapılar,
Sərsəri ahımdan ol gah yapılar, gah açılar.

Hər yana göz salsa ol gülçöhrə eyni-rəşkindən,
Könlümə hər kirpiyi, vah kim, tikan tək sancılar.

Tilbə könlüm hər yana yetsə bədən viranından,
Eşq səhrasında Məcnunvəşlər içrə tapılar.

Ey müsəlmanlar, özümü bilməsəm keyfiyyətin
Eşq aşubu ara biixtiyar olan bilər.

Gülbün eşqin könül bağında əşkim suyundan,
Mən xud əkdim, bilməm ondan ta nə güllər açılar?

Sərnəvəştim eşq imiş, ey şux, görməyə çarə yox,
Hər kişinin alnına nə kim əzəldə yazılar.

Neçə kim ifa qılar eşqin Hüseyni, vay kim,
Görgəc ol ay yenə biixtiyar əfğan qılar.

**43**

Çün üzünə odlu ahımın şərarı saçılar,
Guya ki zər hoqqadır kim, gül üzünə yapılar.

Kim qəmər dövründə görəndir quyaş zər riştəsin,
Dövr ara bu vəch birlə kim üzünə saçılar.

Üz quyaş, xətti şüayi gər yığılsa olmaya,
Məhvəşim zər riştə qılan zülfüncə kim açılar.

Nə şərəfdir ol pəri Məcnuna kim, könlünü
Qeyd üçün altın səlasil açıban məqam qılar.

Xilqəti-zərbəft ərər, yox ərsə zərkeş saçını –
Hər tərəf çün kim açar, cismi sərasər yapılar.

Göydə çün xurşidi-altın, zib ilə bu növ' iməs,
Yerdə xud andağ haçan bir sə'di-kövkəb tapılar.

Ey Hüseyni, şükür qıl kim, yar vəsli qədrini,
Hicri-mühlik dəştində avara olanlar bilər.

## ❧ 44 ☙

Hansı cənnət səbzəsi xətti-nəmudarınca var?
Ya Məsiha nitqi ol lə'li-şəkərbarınca var.

Naseha, cənnət ümidi birlə varmam köyündən –
Kim, bu mən məhzuna yüz firdövs gülzarınca var.

Abi-heyvan gər rəvanü ruhi-pərvərdir Məsih,
Nə bu rəftarı, nə ol canbəxş güftarınca var.

Ey müsəvvər, necə rəngamizlik, vah, hansı rəng,
Lə'linin şənrəfi, yaxud xətti-zünnarınca var.

Desə ola kim, nəzər fənnini bilməz zərrə,
Kim ki, ayı der: onun xurşid rüxsarınca var.

Pozma aşiq könlünü, nə billah ki, eşq ətvarında,
Heç cürm əhli məhəbbət könlü azarınca var!

Eşq ara Məcnun Hüseyni birlə qılmaz bəhs kim,
Nə özü var onca, nə yarı onun yarınca var.

**45**

Ta gözüm düşdü üzünə, könlüm oldu biqərar,
Sən həm etdin lütfi-mehrindən məni ümidvar.

İndi kim, oldum giriftarın tümən min naz ilə,
Bivəfalıq rəsmi-ayinini qıldın aşikar.

Eyləsəm lə'li-rəvanbəxşinə canım fəda,
Xəncəri-müjgan bilə canımı eylərsən pəgar.

Qönçə tək könlüm başına övrülər, nə istəsə,
Onda, ey gül, qəmzə nişindən salarsan xarxar.

Söyləsəm: başımı eylə astanının toprağı,
Zülm daşı yağdırıb, ondan çıxararsan qubar.

Gər desəm bağrımı eylə itlərinin tö'məsi,
Zağları daşlar, etməzsən itlərinə ixtiyar.

Budur ümidi Hüseyninin ki, ya tanrı sana
Rəhm verər, ya ona səbrü təhəmmül kirdigar.

**46**

Qönçeyi-xəndan varıb, könlümdə qaldı xarxar,
Dinməyir canıma onsuz dünyadə varı nə var.

Sərv qəddlər, lalə ruhlardan açılmaz bu könül,
Vah, necə kim, dəhr bağı içrə yox ol gül üzar.

Vəsli-canından açılar ərdi könlüm bağ-bağ,
Vay, yüz min vay kim, ol mey varıb qalmış xumar.

Harda kim, görsən onu, gülmək bilə xürsənd idin,
Əksin eylə, ey könül, hər yerdə ağla zar-zar.

Vəsl ara hər dəm sana canım fəda olsun dedim,
Neyçün, ey arami-canım, eylədin məndən kənar.

Ey könül, tutgil qənimət şah müzəffər vəslini,
Kim ötübdür dünyada mundağ bəlalar bişümar.

Ey Hüseyni, yarsız sən neylərsən aləm ara,
Qop, adəm sərmənzili əzmin qılıb keynicə var.

## ☙ 47 ❧

Tiği-hicran sovurdu, yetməz vəslindən könlümə bəhr,
Nuşu verməzdən əvvəl verdi mana bir qətrə zəhr.

Olsa yüz il vəsl, axır hicr, ol saət kişi
Tapa bilməzdir visal əyyamından bir ləhzə bəhr.

Qəhər camını dəmbədəm çəkərəm ol bədxuyun,
Guya ki, tanrı məni xəlq eyləmiş çəkməyə qəhr.

Olsa Leyli birlə Məcnun, dəşt ona cənnətcə var,
Leyk onsuz olsa Məcnun, var ona duzəxcə şəhr.

Yar çün könlündədir, adın tutub qılma fəğan,
Haq çü agahdır, onun zikri-hafi-xoşrək ki, cəhr.

Çox könlünü bu çəmənə bağlama, ey əndəlib,
Kim güli-məqsudi hərgiz açmadı gülzarı dəhr.

Düşdü çün hicrinə, indi vəsl töxmün əkəli,
Gözlərindən gör ki, açıbdır Hüseyni iki nəhr.

## ☙ 48 ❧

Məhvəşi yox soralı bu zari-heyrandan xəbər,
Qəmkeşi yox tapalı bu razi-pünhandan xəbər.

Vəsl şəm'i şö'ləsindən görkəzər pərvanə dağ,
Mən kimi ol harda verə daği-hicrandan xəbər.

Vah, hanı ol dilrüba kim, var idi hüsnündə an,
Heç dilbər bu zaman verməz mana ondan xəbər.

Hicrindən bu dəm mana dövranda yüz aşub ərər,
Ah kim, tapmazam ol aşubi-dövrandan xəbər.

Bəs pərişandır damağım ta nəsimi-müşki biz,
Şami-qəm yetirdi ol zülfi-pərişandan xəbər.

Tilbə könlümü ləbin qan eylər, ağzın qıldı güm,
Tapar onu istəyən, ya rəb, bu dəm qandan xəbər.

Hicr dəştində Hüseyni zə'fdən var öylə kim,
İstəyən tapar məgər ol zari-əfğandan xəbər.

**49**

Nə həbibi kim, fəğanımdan ona ola əsər,
Nə rəfiqi kim, mənim halımdan ol tapa xəbər.

Ya ol deyib lə'lindən söz eyləsə canıma qut,
Ya bu pənd deyib öçürsə könlüm odundan şərər.

Ya ol etsə kəm visalı birlə bağrım qanını,
Ya bu desə üzümdə əşkdən xuni-ciyər.

Ol əgər bidad tiği birlə köksüm qılsa çak,
Bu tikib ol çakı, mərhəmdən etsə bəhrəvər.

Zülm birlə ol əgər canıma sürsə tiği-qətl,
Ağlayıb bu halıma, başımda olsa növhəgər.

Neçə can qıldım fəda, nə onu tapdım, nə bunu,
Hər neçə töxmi-vəfa əkdim, cəfa verdi səmər.

Lütf edib, saqi, Hüseynə dolu tutgil qədəh,
Kim bu ənduh içrə ölü, özdən olmaq bixəbər.

**50**

Vah, nə halətdir ki, mən hər necə görkəzsəm niyaz,
Ey mahi-bədmehr, səndən zahir olmaz qeyri naz.

Kimə kim, verdim könül, vah, düşməni-candır mana,
Olmazın heç kimə mən tək eşq ara suzü güdaz.

Taleyim zə’findən olar qaçmağın mən tilbədən,
Yox isə nagah pəri Məcnundan edər etiraz.

Yox dürur eşq əhli içrə mən kimi rüsva yenə,
Görkəzib çox mehr yarına, vəfasın görən az.

Necə kim, gördün cəfa, mehrini əfzun eylədin,
Ey Hüseyni, yox dürur aləmdə sən tək eşqbaz.

## ❧ 51 ☙

Nərgiz almaz yerdən ol fəttan gözün alnında göz,
Ağzın alnında tutulmuş qönçənin ağzında söz.

Rəngsiz xalın boyana, həll qılar göz mərdümin,
Sürtərəm şayəd uşbu riv ilə xalına göz.

Qılmagil üşşaq ara mən tilbədən biganəlik,
Kim qılıbdır hüsn əhli dünyada çox yadını öz.

Vəsl ara, hər kimi görgəc iltifatın pozmadın,
Ey könül, hicran oduna necə yansan indi yüz.

Ta ki köyün toprağın sovurdu rüxsarımdan, ah,
Üzr üçün alnında qoydum hər zaman toprağa üz.

Çərx çün pozdu qərarü səbrü huşum külbəsin,
Sən həm, ey tufani-əşkim, var onun tərxini poz.

Çün Hüseyni tövbə sındırdı, müğənni düz nəva,
Həm hüseyni pərdəsində, saqiya, sən badə süz.

### ❧ 52 ❧

Göz qarasın xal qılıb, yazdım sana əczü niyaz,
Göz yaşımı  həm səpib ol naməyə, ey sərvinaz.

Eşq yetgəc əqlü huşü səbr hər yan pıtraşar,
Od yana üzlənsə vacibdir ol elə etiraz.

Aşikarə can əgər lə'lin sözün deyər, vəleyk
Yaşırın qönçən bilə könlümü vardır özgə raz.

Ol nə qamətdir ki, barça rastlar eylər dua,
Der ki, bu gülşən ara ol sərvi olsun sərfəraz.

Şövqü səbrim nəqdini eylər onu görgəc fəda,
Deməsə eyb eylər ol məhvəş buları köpü az.

Çün həqiqət nuru ol ariz təcəlli səndədir,
Nə həqiqət ol ki, onun eşqini oynar məcaz.

Ey Hüseyni, yar köyi-Kə'bəsi novruz ərər,
Nə əcəb gər binəvalar eylər ahəngi-Hicaz.

## 53

Eşqi mən’ etsələr şövqüm odu eylər sətiz,
Şö’lə yanlığ kim nəfəs təsiri eylər onu tiz.

Eşq daim zə’flik, cismimi istər örtəyə,
Allah-Allah, necə qılım bərg xas birlə sətiz.

Cüz’i-cüz’üm hicr ara bir-birdən ayrılmaq dilər,
Kaş qılsan hicr tiğindən tənimi riz-riz.

Tirədir ol türrə guya, kim fələk pərvizini,
Xəttin üzrə oldu hicranım donundan müşkbiz.

Qamətin sərvi bu aləmdə qiyamət bəs durar,
Cilvə birlə pəs yenə hər ləhzə salma rəstixiz.

Yardan ayrı dirilik istəməzəm, saqiya,
Hicr zəhrindən mənim camıma olgil cür’əriz.

Ey Hüseyni, rövzə eşq əhlinə dilbər köyüdür,
Tapsalar zöhd əhli cənnət, sən onun köyündə gəz.

**54**

Bəd əz in, ey hüsn əhli, eli şeyda qılmanız,
Bivəfalıq eyləyib, aləmə rüsva qılmanız.

Anla, ey əhli-vəfa, gər ölsəniz çəkib cəfa,
Bivəfalardan vəfa rəsmi-təmənna qılmanız.

Mən yesiri-eşqəm, qovğa nədir üşşaq ara,
Ey rəfiqi-fəndgu, dedim ki, qovğa qılmanız.

Mən ölər halətdəyəm, ey yar köyü itləri,
Eyləyib qovğa mənim sirrimi ifşa qılmanız.

Od düşübdür dəşt üzrə ahımdan, ey əhli-tərb,
Laləzar eylər təsəvvür, əzmi-səhra qılmanız.

Sirrin ilə aşikar eylər kişiyə eşq ara,
Zinhar, öz sirrinizi aşikara qılmanız.

Bir nəfəs canan bilə tapmış Hüseyni xəlvəti,
Varın, ey cani-könül, bir dəm əcalə qılmanız.

## ❧ 55 ☙

Ol quyaş köyündə mən avaranı bənd eyləniz[1],
Barı bu təzvir ilə könlümü xürsənd eyləniz.

Köyündə mən tilbəni yüz cəbr birlə öldürüb,
Ol süqubətləri yüz divanəyə pənd eyləniz.

İstər-istər tapsanız könlümü kim pozmuş mənim,
Vəsl tiği birlə siz pərkənd-pərkənd eyləniz.

Xəstə könlüm zə’fi-həddən ötsə qüvvət kəsbinə,
Dostlar, ol üzü ləb yadını gülqənd eyləniz.

Köynəyin çak etsə ol məst, eylərsiniz rüfu,
Rişteyi-canımı hər tarına peyvənd eyləniz.

Könlümə elmü ədəb təlimi çox vermək bilə
Vamiqü Fərhadü Məcnun tək xirədmənd eyləniz.

Gər Hüseyni desəniz şoraba tökək təlx-təlx,
Xublar, gahi ona baxıb şəkərxənd eyləniz.

[1] Eyləniz – ediniz (çağatayca).

**56**

Qan görüb əşkimi, könlüm naləsini sormanız[1],
Çak olub köksüm, ciyər pərkaləsini sormanız.

Əzm edib ol qönçeyi-xəndan adəm gülzarına,
Üz sarı açan sirişkim laləsini sormanız.

Çünki vardı yaşım indi göz ağından qətrələr,
Damanın hər yan görüb, qəm jaləsini sormanız.

Tirə könlümdə üzün, gərdimdə dərdin görən el,
Qəm tünündə ayi-möhnət haləsini sormanız.

Hicrində görən Hüseyninin fəğanın, dostlar,
Yusif üçün piri-Kən'an naləsini sormanız.

---

[1] Sormanız – sormayınız (çağatayca).

**57**

Bir nəfəs ol ayı görmək çün iməsdir dəstrəs,
Onu görən yeri, vah, varıb görəmməm hər nəfəs.

Kövkəbi-əşkim şəfəqin gün gəlsə vah ərər səza,
Mən ki, sübhi-vəsl ara hicran tünün qıldım həvəs.

Xamlıqdan gər həvəs qıldım fəraqın vəsl ara,
Ey fələk, canıma yetdim, gər həvəsdir uşbu bəs.

Harda kim, basdın ayaq, axdı sirişkim onca kim,
Lalə verdi, var ol topraq ara hər xarü xas.

Ey Hüseyni, hicrində cismim ara könlüm quşu
Güldən ayrı əndəlibindir giriftari-qəfəs.

## ❧ 58 ❧

Eylədi lə'li-təbəssüm, qönçeyi-xəndan iməs,
Dağını könlüm qanatdı, laleyi-nüman iməs.

Səbzeyi-xətt birlə guya qönçə ağzı nəqşidir,
Könlüm içrə navəkindən qeyri peykan iməs.

Vah, görün ki, mən quyun tək aylanıb bir yar üçün,
Dəşt üzə, ey dostlar, Məcnuni-sərgərdan iməs.

Hər dəm ol kirpik xəyalı can rəgindən qan tökər,
Yoxsa məhzun könlüm içrə nəştəri-hicran iməs.

Ey könül, bir dövrün sər fitnəsidir kim, məni
Böylə rüsva qıldı, yoxsa fitneyi-dövran iməs.

Demə kim, alnında can ver, yoxsa eşq tərkin et –
Kim, ol asandır mana, leykən bu bir imkan iməs.

Gər Hüseyni nalə qılsa eşq ara, eyb etməyin,
Kim dürur aşiq kim, onun şivəsi əfğan iməs?

**59**

Ol pəri könlü məni-divanəyə mail iməs,
Ya mənim avara könlüm eşqinə qabil iməs.

Verdin, ey Məcnun, mənim rüsvalığım görəndə pənd,
Bilmədinmi, barça el huş əhlində aqıl iməs.

Natəvan cismimdə hər yandan görünən dağ ara,
Onda hicran dağından yüzdən biri daxil iməs.

Tünd badi-hicr əsib, cismim sovurdu köyündən,
Yoxsa quyun tək ötənə onda müstəcil iməs.

Xətti-nəqşi xatirimdən tiğ ilə dəf olmadı,
Vah, nə xəttdir kim, neçə bilən sayı zail iməs.

Eşqdən qıldım yenə taəti, vah kim bilmədim,
Kim qəza oxuna təqva cövşəni-hayil iməs.

Çün Hüseynidir, gədayın hüsnündən vergil zəkat,
Ey məlahət məxzəni, ol sim alar, sail iməs.

**60**

Məndə hər dəm yüz niyazü, onda istiğnayü bəs,
Hər zaman yüz can verəm, ol şux bipərvayü bəs.

Deməyin kim, zülfi-sevdası həzin könlündə var,
Kim ərər divanə könlümdə həm ol sevdayü bəs.

Eşqi-taracında vardı dini-islamın dağı,
Deməyin kim, olmuşam divaneyi-rüsvayü bəs.

Nə könüldə səbr qoydu, canım içrə nə qərar,
Yox ki, eşqin əqlü huşum eylədi yağmayü bəs.

Yerə girsin əşk kim, axızdı bağrım qan edib,
Yox ki məxfi sirri-eşqim eylədi ifşayü bəs.

Qılmadı üşşaq əqlü dinü nənü nam tərk,
Bunca rüsvalıq qəbul etdim məni rüsvayü bəs.

Ey Hüseyni, eşq ilə çün afiyət cəm olmadı,
Hər nə gəlsə urma dəm, könlüm ara əsrayü bəs.

## 61

Ya rəb, ol gül içrə qönçə niyə güftar eyləməs,
Ya bilib, bilməzə salıb, sirrim izhar eyləməs.

Daş ilə polada ahım odudur kargər,
Nə qatıdır ol könül kim, heç ona kar eyləməs.

Ol cəfakəş bilə əhvalım, qatı sə’b ərkənin,
Kim olub qanlar qəm eşqin pədidar eyləməs.

Eşqi-mənada qılar naseh dili könlümü riş,
Yoxsa bu qəm qönçəsin dan yeli əfgar eyləməs.

Tubi-cənnət əgər yüz naz ilə qılsa xürrəm,
Sərvinazım alnında ol əzmi-rəftar eyləməs.

Ay üzün təqlidinə nəqqaşi-Çin hər dəm çəkər
Yüz rəqəm, leykin birin yüzdən nəmudar eyləməs.

İnsü cinə gərçi yox naləmdən uyğu, vah, nə sud,
Kim dəmi-naz uyğusundan onu bidar eyləməs.

Sən ki çəkib tiğ, el boğazın çəkərsən hər tərəf,
Barçası tə’cil üçündür, kimsə zinhar eyləməs.

Gər Hüseyni eşqini iqrar çəkər əhli-zöhd,
Əhl iməslər, yoxsa ol bu işdən inkar eyləməs.

**62**

Eylə kim, gül içrə qönçən hər necə mə'lum iməs,
Qönçə ağzın necə kim, söz desə həm məfhum iməs.

Ol quyaşın pərtövün köyündə görsəm, yox əcəb,
Heç kim cənnətdə tubi-nurundan məhrum iməs.

Eşq zülmündən əgər Fərhadü Məcnun öldülər,
Məndə hər dəmdir ölüm, mən tək olar məzlum iməs.

Şah hökmü birlə könlüm eşq tərkin tutmaya,
Şah ərər hakim, vəli bu kimsəyə məhkum iməs.

Eşqi-mey cürmünə deyr içrə məni yazmayınız,
Niyə kim, məsciddə dəxi heç kim mə'sum iməs.

Nə bəladır eşq kim, gördüm onun övraqında,
Dərd ilə möhnətdən özgə nöqteyi-mərqum iməs.

Gər Hüseynin in visalın dövlətdən, ey sənəm,
Yası çox mövcud isə, ümidi həm mə'dum iməs.

**63**

Ey könül, ol dilrübanın özgə yarı var imiş,
Vah, sana düşmən olub, ol özgələrə yar imiş.

Hər zaman yüz var, dil  azarından könlümdədir,
Vah ki, azarı pozuq  könlümdə bunca var imiş.

Dərdi-eşqin şərhini gözümə degəc, tökdü yaş,
Vah kim, onu yar sandım, vəli ol əğyar imiş.

Zar olub eşqinə, azarın gəlməyin bilmədim,
Zarlarına eşqdən gələn nəsibi-azar imiş.

Yüz açıb örtər məni, vah, eşq odundan nə gilə,
Kim mana od salıcı ol atəşin rüxsar imiş.

Hicrində biçarəlikdən ahü vaveyla, nə sud
Kim bəlalı eşqində biçarəlik naçar imiş.

Ey Hüseyni, der idin ol dilrübanı bivəfa,
Mən onu fəhm etmişəm kim, yüz onca var imiş.

**~ 64 ~**

Ey könül, olsan vəfasız dilrübalardan xilas,
Şükür qıl, olan kişi yalı bəlalardan xilas.

Ömr yanlığ bivəfadırlar özümü istərəm,
Ömr əgər qılsa vəfa, bu bivəfalardan xilas.

Tilbə könlümdən xilas olmaz pərivəşlər qəmi,
Rast andağ kim ola, olmam mən olardan xilas.

Tazə-tazə dağ könlümdən qara salan kimi,
Mümkün olmaz olmaq ol üzü qaralardan xilas.

Xanəgahdan ta xərabat içrə girdim, qıldı haqq
Həm riyadan, həm riyayi-parsalardan xilas.

Dəhr əlindən, ey ki oldun münqəte', şükür eylə kim,
Həm cəfagərlərdən oldun, həm cəfalardan xilas.

Ey Hüseyni, vəsl ümidindən rəqibin oldu xalq,
Özünü qıl həm müddəi, həm müddəalardan xilas.

**~ 65 ~**

Eşqdən ta qılmışam peyda, məni şeyda mərəz,
Edəcəkdir zə'flik cismimi napeyda mərəz.

Eylə kim, darüş-şəfa içrə vətən tutar məriz,
Eyləmiş canü tənü könlüm öyün mə'va mərəz.

Yüz mərəz qəsdimdədir, kim gördü belə xəstə kim,
Başında əhli-qəza tək eyləyər qovğa mərəz.

Zə'f ara xunxarəlikdən heç pəhriz eyləməz,
Bunca kim daim çəkər ol nərgizi-şəhla mərəz.

Zülfi-zəncirindən özgə yox əlacım, ey həkim,
Tilbə könlümə ki, olmuş mayeyi-sevda mərəz.

Zə'fim aşmış, söz deməm ol ay sözündən özgə kim,
Xatiri-nazik olar tapanda istila mərəz.

Ey Hüseyni, mey bilə qılgil xumarın fikrini,
Dəf həm səhba qılar, çün gətirər səhba mərəz.

**66**

Ey cəmalın gülşənində səbzeyi-sirab xətt,
Arizin kafuru üzrə zibi-müşki-nab xətt.

Qətlimə müşkin xəttin hər hərfi oldu bir səbəb,
Kim dirilər çün mürəttəb eylədi əsbab xətt.

Xətt əsər zahir qılıbdır səfheyi-hüsnün üzə,
Ah ol gündən ki, zahir eyləyə əqrəb xətt.

Xətt pozuldu, leyk mə'lumun olar giryanlığım,
Böylə kim, yazdım fəraqın zülmündən ağlab xətt.

Firqətində tabü piçin şərhini qıldım rəqəm,
Sətr ara hər yerdə zahir qıldı piçü tab xətt.

Ey həbibim, xamə sür, rüq'əm cəvabına ki var,
Vəslcə kim bir-birinə yazsalar əhbab xətt.

Ey Hüseyni, şərhi-halım yazsam olarsan mə'lul,
Çün oxur halətdə zahir eyləsə itnab xətt.

### 67

Könlüm etdi eşq əsrarın qılıb təkrar hifz,
Kim ki qılan tək kəlam pakü həyyi asar hifz.

Xublar öz hüsnü vəsfin gər qılarlar, nə əcəb,
Eybi yox, büt vəsfini gər qılsalar küffar hifz.

Gül üçün bağ içrə bülbül min nəva örgənmədi,
Kim əzəl gülzarında qılmışdır ol əsrar hifz.

Dəhr gülzarında ol gül hüsnün öysəm, eyb iməs,
Xassə kim, qılsa sözüm ol sərvi-gülrüxsar hifz.

Yar hər söz desə, hərgiz xatirimdən çıxmaz ol,
Özgələrdən olmadı könlümə bir güftar hifz.

Qıl igidlikdə igidlər eşqi-sirrin hifz kim,
Söz olar ərmiş qarılıq vəqtində düşvar hifz.

Yüz min olar ərdi min dastanın, ey bülbül, əgər,
Qılsan ərdi eşq əsrarın Hüseynivar hifz.

**68**

Dişi vəsfində dedim: dür kimi yeksan əlfaz,
Zülfi-sevdası ara leyk pərişan əlfaz.

Eşq əsrarı fəsahət bilə tapmaz təqrir,
Tuti dillərə bəsi sə'bdir asan əlfaz.

Müddəilər sözü bimənа əgər olsa, nə qəm,
İstəmə məna əgər, istə nadan əlfaz.

Ləfzi təsir qılıb örtər onun mənasın,
Çün sorar şərhi-dərdi-qəmi hicran əlfaz.

Tərki-eşqin desəm öldür, mah ki der mənasız,
Öz-özü birlə cünun əhli firavan əlfaz.

Ağzın əsrarında çoxdur sözümü deyə almaz,
Gər qulaq assa deyəyin bir neçə pünhan əlfaz.

Binəva oldu Hüseyni, nə nəva tapar əgər,
Vəslindən zahir ona eyləsə canan əlfaz.

**69**

Ah kim, hicran odundan yandı canım özgə növ’,
Yandırdı aləmi, həm odlu fəğanım özgə növ’.

Xəstə könlüm zə’f edər, vaqif olun, ey dostlar,
Kim bu gündəndir bu zari-natəvanım özgə növ’.

Tilbə könlümü cünun vadisi içrə istəməm,
Kim bu qatla etmiş ol bixanimanım özgə növ’.

Halətim Fərhadü Məcnun qissəsinə oxşamaz,
Kim ərər eşq içrə mühliki-dastanım özgə növ’.

Vədə qıldı vəsl üçün, oldum yesiri, vay kim,
Sözləşər ol zalımi-namehribanım özgə növ’.

Olmağım rüsva eyb ərməs kim, bu qatla xalq ara,
Faş oldu əsrəyən sirri-nihanım özgə növ’.

Könlüm alıb canıma qəsd etdi ol biganəvəş,
Ey Hüseyni, var idi ondan gümanım özgə növ’.

**70**

Daği-eşqin vermiş ərdi əqli-huşumdan fəraq,
Vah, nə qoydu şö'leyi-hicranın ol dağ üzrə dağ.

Xublar hüsnünü gərdun arizindən yarudar,
Rövşən edən tək bir odun şö'ləsindən yüz çıraq.

Könlüm etdi köyündə bir oda düşən tilbəni,
Heç aşiq görən olarmı deb eylər mən soraq.

Gözlərin kim oldular bimarlıq eynində məst,
Türfə işdir kim, iməslər göz yumub-açınca sağ.

Hüsn bağında üzün birlə ləbindən zib ərər,
Görmədik bir fəsldə gül birlə verən meyvə bağ.

Saqiya, zə'fim əlacı badədir, qəfləti qoy,
Kim əlindən varğu tək mən içməsəm bir dəm ayaq.

Ey Hüseyni, şami-hicri-zülfi-sevdasın demə,
Kim məni divanəyə onsuz müşəvvəşdir dimağ.

### 71

Qəm sipah qəsdimə çıxdı, saqiya, tut cami-saf,
Kim olar cami-mey içəndən dilir əhli-məsaf.

Cüz məlalət, yox dirilikdən çü ol ay hicrində,
Tutgil, ey eşq, indi ol təklifdən bizi müaf.

Köksümə oxü qılıncından ərər heyrət bəsi,
Kim bu bir hər neçə dəysə, ol biri eylər şəaf.

Eşq dəsti-zoru gər budur mənim əczim, nə eyb,
Əjdərha gər olsa öz əczini qılar e'tiraf.

Desə könlüm: tutum özgə yar, eşqin tərk edib,
Eyb iməsdir məst ilə divanədən lafü qəzaf.

Kə'beyi-köyün ərər, andağ müqəddəs rövzə kim,
Hüri kövsər içrə qüsl eylər, onu eylər təvaf.

Ey Hüseyni, görməsən dövri-müxalifdən nəva,
Cani-dövründə gərək fəhm olmasa səndən xilaf.

## ☙ 72 ❧

Köyündə itlər onun kim çıxdı hər yan müxtəlif,
Tilbə könlüm guya kim, onda oldu mütəkif.

Qəm tünü cismim ara kim, tiğ sürdüm hər tərəf,
Sərvi-qəddin yadı birlə hər biridir bir əlif.

Xəstə mürrüyəm mən, ey eşq, eyləmə bidad kim,
Əjdərha alnında öz əczinə olar mütərif.

Eşq ara gər niş gəlsə, nuş görməkdir hünər,
Sə'b ərər hər kişi olmaq bu sifətə müttəsif.

Ah kim, ol sərvi-tabi el bilədir müstəqim,
Qatı ahımdan mənim birləmi ərkin münhərif.

Naseha, pəndim cünun sən mənə izhar eylədin,
Tilbəyə əql öyrədərsən, guya ki oldun hərif.

Eşq ara afət səlamət köyündədir afyiət,
Ey Hüseyni, xoşdur ol yan qılsan özün münsərif.

**73**

Qıldı bəxtimi qara, zülfü tək ol mah əz fəraq,
Necə yandırar məni-dilxəstəni, ah, əz fəraq.

Gərçi vəchülladır ol ay tək üzü, ya rəb, nədən,
Dirildər gah vəsli birlə, öldürər gah əz fəraq.

Daneyi-xalın xəyalı birlə, ey gül, xirməni
Necə sovurdun məni həsrətdə çün kah əz fəraq.

Hər kişinin canına gəldi əcəl bir yol bilə,
Ah, gəldi canım üçün eylədi rah əz fəraq.

Aqibət yüz dərdü həsrət birlə bu miskin Hüseyn,
Öləcəkdir görməyib üzünü nagah əz fəraq.

**74**

Var imiş yar iştiyaqı, əsrü qatı iştiyaq,
Vəsl tapmam, vah, tükənməz dərd imiş dərdi-fəraq.

Özgə eşq əhlini bilməm, vah, mana yoxdur nəsib,
Eşqdən qeyri əz fəraqi-yardan cüz'i iştiyaq.

Yarsız görməm həyatımı dirilik sane'yə,
Vah, nə imkandır diri olmaq sevər candan iraq.

Ey ki Leyli hicrində sərgəştə Məcnun halətin
Dersən, anla kim, niçin ərmiş mənim halıma baq.

Ey səba, gəldin, Hüseyni tilbə könlün soralı,
Var da məndən ol pəri köyü sarı qılgil soraq.

**75**

Lə'li üzrə səbzeyi-xətti-nəmudarına baq,
Şux rə'namızın şənrəfrü zəngarına baq.

Ey ki bir zəncir küfr içrə tümən min əhli-din,
Görmədim dersən müqəyyəd zülfi-zünnarına baq.

Sərvi üzrə gül görməyən olsan, qəddü üzünü gör,
Canı şirin istəsən lə'li-şəkərbarına baq.

Ey ki cənnət rövzəsi içrə dilərsən sərvi-gül,
Gülşən köyünə gir, qədd bilə rüxsarına baq.

Zəxmi-mühlik könlüm əhvalına, cana, rəhm qıl,
Qanı durmaz yarasın gör, naleyi-zarına baq.

Dəhr bağının riyahına yox buyi-vəfa,
Ha rə'na laləsin gör, ha gülzarına baq.

Gər Hüseyni sə'b halın eşqin içrə bilməsən,
Çeşmi-xunrizinə göz sal, cismi-əfgarına baq.

### ☙ 76 ❧

Ah kim, eşqim odunun bir zaman aramı yoq,
İstəyən aram ol oda cüz' xəyal-xamı yoq.

Vəsl şəm'indən yarub, pərvanə halım nə bilər?
Şami-hicrim tək çü onun bir qarañu şamı yoq.

Arizini ay desəm ərməs müvəccəh niyə kim,
Ayın afətli gözü – rüxsareyi-gülfamı yoq.

Bunca din əhlinin, islamın alıb kafir gözün,
Vah, nə halətdir ki, bir kafircə həm islamı yoq.

Xalq səyd edəndə dəng ərməs sənin birlə quyaş,
Zülfi-xalı tək çü onun danə birlə damı yoq.

Olsa aləm kamranı kəmsiz ömr ötürər,
Kim ki, bir şirin təkəllümün ləbindən kamı yoq.

Ey Hüseyni, neçə gün xoş tut çü fani dəhrini,
Kim iməs Cəmşid hər şah kim, qolunda canı yoq.

### 77

Qönçəni ağzın desəm, vah kim, onun güftarı yoq,
Sərvini qəddin desəm, neylək, onun rəftarı yoq.

Ayı nə yanlığ sana nisbət qılaq, kim hüsn ara,
Sərvi tək həm qəddi yox, həm gül kimi rüxsarı yoq.

Zülfünə sünbülü nə növ’ eyləyim təşbih kim,
Həm dil asa ətri, həm can riştəsi tək tarı yoq.

Demə qızıl lə’linə yaqut oxşar kim, onun
Həm şirinlik təamı, həm canbəxşlik asarı yoq.

Gər rəqibindən məni əskik görərsən, bak iməs,
Kim ki, aşiq oldu, itdən kəm desən həm arı yoq.

İstəsən könlümə asayiş, qədəh tut, saqiya,
Kim dəmi yox, kim ulusdan yüz tümən azarı yoq.

Köyündə iti, Hüseyni, könlü eyb yox istəsə,
Kim olubdur onda bir divaneyi-əfgari yoq.

**78**

Tilbə könlüm ta ərər eşqində şeyda, ey rəfiq,
Eyləməz özgə pərilər sarı pərva, ey rəfiq.

Tapdı ömri-cavidan, azarda canım ta ərər,
Lə’li-sirabın Xıdır, sözün Məsiha, ey rəfiq.

Türrəni rüxsar üzə qıldın pərişan, vah, nə qəm,
Gər dimağımı pərişan qılsa sevda, ey rəfiq.

Xalqdan eşqini pünhan eyləmək məqsud ərər,
Özgələr sarı gözüm gər düşsə ümdə, ey rəfiq.

Örtədi könlümü mehrin, zərreyi varmı ikən,
Bu hərarətdən sənin könlündə, aya, ey rəfiq.

Bülbülü-şeyda əgər gülzar ara məskən qılar,
Tilbə könlümə ərər köyündə mə’va, ey rəfiq.

Gənci-vəslin kim, dilər miskin Hüseyni, vah ərər,
Ol gəda kim, şahlıq qılar təmənna, ey rəfiq.

**79**

Ey səadət mətləi ol arizi-mahın sənin,
Əhli-binəş tutiyası xaki-dərgahın sənin.

Ol vəfasız könlündə çün yox dürur rəsmi-vəfa,
Ey könül, nə yerə yetər naleyü ahın sənin?!

Qılmagil hicran əlindən şikayət, ey könül,
Aqibət olar müyəssər vəsli-dilxahın sənin.

Yar rəb, ol dövlət müyəssər dünyada olarmı kim,
Səhhət tapar üzün görgəc bu gümrahın sənin.

Necə yaşırdın sən indi eşq sirrini el ara,
Faş edər axır, Hüseyni, çöhreyi-kahın sənin.

**80**

Səndən ayrı düşəli, ey mahi-tabanım mənim,
Dəmbədəm qan yaşı ağlar çeşmi-giryanım mənim.

Çün məni vəslin bilə şad etməsən, sorsan olar –
Kim, niçin sən dərdimə, ey sinə büryanım mənim.

Eşiyində gecələr ahəstə indi ağlaram,
Kim itinə verməsin zəhmət bu əfğanım mənim.

Dərdi-eşqin həddən aşdı, qorxaram kim nagahan,
Aşikarə olmaya bu sirri-pünhanım mənim.

Dedi: mənsiz dünyada nedib dirildin, ey Hüseyn,
Rast dersən, yazığımdan kecdin, ey canım mənim.

## 81

Qalğac ahım sərsəriyə beytül-həzanım mənim,
Yağdırar gərdi-bəla başıma viranım mənim.

Eşq səhrası ara hər sarı qanlı lalədir,
Orda bağrım dağından axmış məgər qanım mənim.

Edəli könlüm pərişan, mən ki qaldım bilməyib
Ha tərəf getmişdir Məcnuni-pərişanım mənim.

Bu ki lə'lin dirildər eli təkəllüm eyləyib,
Mən bilərəm uşbu mühlik qəmiyü canım mənim.

Navəkin çəkdi könüldən türfə gör kim axtarar,
Çaklar eylər ki, qalmış onda peykanım mənim.

Aşikara odlarıma çarə qılsan, ey təbib,
Onu neylərsən ki, yaxar daği-pünhanım mənim.

Ey Hüseyni, nalə qılsam öldürər kafir gözü,
Guya ki, qoymaz onu uyğuya əfğanım mənim.

**82**

Dudi-hicrindən qaraldı beytül-həzanım mənim,
Seyli-əşkim birlə həm yumruldu viranım mənim.

Hər zaman qorxuzma kim, canını alam cəbr ilə,
Al, fəraqın cəbrindən qalar isə canım mənim.

Eşqində çak eylərəm köksümü bu vəhm olmasa,
Kim ulusa zahir olar daği-pünhanım mənim.

Xaniman tərkin qılıb itdi könül kim, bilmədim,
Harda vardı ol ala-xanü ala-manım mənim.

Əzm qıldım eşqi-bidadını zahir qılalı,
Asmadı, vah kim, qulaq halıma sultanım mənim.

Nə əcəb könlüm fəğanından ulus tapmaq vüquf,
Kim deşilmiş, vah, könül ta pakından yanım mənim.

Ey Hüseyni, mən əgər avara oldum, qəm iməs,
Ömrü dövlət birlə olsun könül alanım mənim.

**83**

Düşəli hicrində ey sərvi-güləndamım mənim,
Nə gözümdə uyğu var, nə canda aramım mənim.

Yetirərəm şama hicrin günün yüz rənc ilə,
Dana, vah, bilməm ki, nə yanlığ yetər şamım mənim.

Hər haçan meygün ləbin hicranında çəksəm qədəh,
İki göz xunabındandır ləbaləb canım mənim.

Suzi-eşqimi səbadən, vah, nə növ' irsal edək,
Kim səmum olar səba yetirsə peyğamım mənim.

Deyərsən, ey namə, göndər peyk: zarü xəstədir,
Gər Hüseyni halından sorsa dilaramım mənim.

## ☙ 84 ❧

Vah ki, eşqindən cahan içrə fəğanımdır mənim,
Barça köyü küçədə yüz dastanımdır mənim.

Rədü bərq ərməs bulud içrə görünən hər tərəf,
Bir quyaş hicranında odlu fəğanımdır mənim.

Xalq daği-aşikarı bilsə nə sud, ey könül,
Ol ki bilməz qalıcı daği-nihanımdır mənim.

Cism ara bu xəstə candan gəlməgil hər dəm sözə,
Kim bir-iki gün bu öydə mehmanımdır mənim.

Ömr üçün qılsam dua, sən qılmagil, ya rəb, qəbul,
Çün həyatım istəməs şuxu ki, canımdır mənim.

Çün pişan gözümdə qəddinin xəyalı bitəli,
Cuybar ətrafında sərvi rəvanımdır mənim.

Ahü xunabımı ləhnü badə etmişdir güman,
Ol cəfaçı, əhdi yalan bədgümanımdır mənim.

Yardan cüz' yaxşılıq gəlməz, vəleykin alnında,
Zülmünə bais könlüm, atlı yamanımdır mənim.

Gər könülsüzlükdən ölsəm, ayıb qılma, ey Hüseyn,
Vah, necə verməs könül kim, dilistanımdır mənim.

**85**

Şami-hicranım görüb sən mehr adını tutmadın,
Vədeyi-sübhi-visal edib onu yarutmadın.

Vəsl bəhrin tapmayıb düşdüm çü hicran bərrinə,
Mən səmumi-hicr ara köydüm, əlim kim, tutmadın.

Sən zülal vəslini tutgil qənimət, ey könül,
Vəslin istəyib, nə qanlar hicrində kim, udmadın.

Ey könül, gər lafi-eşq ursan müsəlləmdir sana,
Çox cəfa ondan görüb, mehrini heç əksiltmədin.

Ah kim, miskin Hüseyni öldü bu həsrət bilə,
Bir gün onu itlərin heylinə sən yavutmadın.

**86**

Zülf açıb mən tilbəni aşüftə əhval eylədin,
Çini-əbru görsədib könlümü bihal eylədin.

Öpəli gəldi könül zülfün üçün, ey sərvinaz,
Sərfəraz eylər mahalda onu paymal eylədin.

Can quşun səyd eyləməyə lə'lin üzrə, ey quyaş,
Daneyi-mehr əkdin əmma, adını xal eylədin.

Hər haçan dedim vəfa qıl, eylədin yüz min hiyəl,
Hər haçan dedim cəfa qıl, onu filhal eylədin

Qətl edək deb gəlmədin başıma, ey sərvi-rəvan,
Özgələr qətlinə oldunmu, nə ehmal eylədin?!

Tiği-qətl urdun könlümə, şükr ərər, leykin mana
Kim vəfasızlar qəmindən fariqül-bal eylədin.

Gər Hüseyni hicr ara dedi: fəğan eylə, fəğan,
Şükür kim, vəslin bilə ol dəm dilin lal eylədin.

## ☙ 87 ❧

Eşq yesirin aşiq olan mübtəlalardan bilin,
Vəsl kamın tapmaz, ölən binəvalardan bilin.

Eşqü hicrü dərd qəsdim qıldılar gər halıma,
Vaqif ərməssiz, bu üzlənən bəlalardan bilin.

Təndə hər ox zəxmindən bağrımda eylər bir başaq,
Ol başaqların hesabın bu yaralardan bilin.

Eşq ara ənduhü həsrətsiz necə könlümə zə’f,
Qüvvətin ol natəvanın bu qəzalardan bilin.

Ey ki, bilməzsiz cünunum, çün sorarsız halətim,
Onu şərh edəndə naməfhum ədalardan bilin.

Bilməyənlər eşq bidadını Məcnun halına,
Bir cəfa mən çəkən dürli bəlalardan bilin,

Ruzigarımın qara olmaqlığı keyfiyyətin,
Ey ki bilməzsiz, gözü qaşı qaralardan bilin.

Cami-Cəmlik şahların həşmətin meyxanədə,
Dərd üçün sınan sifal əltər gədalardan bilin.

Gər Hüseyni halətin eşq içrə bilməzsiz, onu
Rindlik köyünə düşən parsalardan bilin.

**88**

Hicr dərdin hicr görən natəvanlardan bilin,
Vəsl ilə işrəti bilən kamranlardan bilin.

Bilməyən əhbab, mən avara olan halətin,
Köyündə hər yanı qılan rəngi qanlardan bilin.

Ey ki, bilməzsiz, nə qatil zəxmi birlə ölmüşəm,
Zəxmi çox cismim ara, mühlik nişanlardan bilin.

Mehr vadisində itən mehribanlar könlündən,
Ey ki, olmazsız xəbər, namehribanlardan bilin.

Ey ki, bilməzsiz məni Məcnun qəmü dərdində fəxr,
Sə'bi-əhvalımı yazan dastanlardan bilin.

Bikəsü avaralıq elmin müdərris anlamaz,
Ol sapağı mən kimi bixanimanlardan bilin.

Gər Hüseyni halını bilməzsiz, ey əhli-nəşat,
Könlü çəkən hüznü dərdəfza fəğanlardan bilin.

### 89

Qəm yeli cismim binasın oldu viran qılğu tək,
Hansı viran kim, qara yer birlə yeksan qılğu tək.

Dərdi-qəm seyli dəxi könlüm hərriminə düşüb,
Ol səvad içrə pozuqluq olca imkan qılğu tək.

Əşki-xunabı iki giryan gözümün yağmuru,
Səbrü huşum kişvərin pozmağa tufan qılğu tək.

Girməyər ərdim məhəbbət köyünə, bilsəm idi,
Kim olar rəncü süqubət bunca tüğyan qılğu tək.

Şö’leyi-ənduh yaxar xəstə canım xirmənin,
Sərsəri ahım külün hər yan pərişan qılğu tək.

Saqiya, mey tut ki, şayəd məstlik ola mana,
Bunca müşkül halı fil-cümlə asan qılğu tək.

Ey Hüseyni, yetməsə ol ay sənin fəryadına,
Çərxi-əncüm xud iməs dərdinə dərman qılğu tək.

**90**

Ol səvadi-xətt içində lə’li-xəndanın görün,
Bəhri-qəm içrə gözümün dürri-qəltanın görün.

Çaklardır könlüm ol üz rəşkindən vah lalə tək,
Ortasında tazə dağı, dövründə qanın görün.

Çöhrə birlə səbzeyi-xətti ərər hüsnünə zib,
Hüsn bağı zinəti gül birlə reyhanın görün.

Göz qara qılmış, könül mülkünü tarac edəli,
Hər sarı saplar düzən ol heyli-müjganın görün.

Göz bilə könlümə qan ol saldı gər bavər iməs,
Gözdə lə’li-əksiyü könlümdə peykanın görün.

Bu çəmənim güllərində yox vəfa, ey xublar,
Pəs vəfa qılmaq qənimət hüsni-dövranın görün.

Ey ki, dersiz kim, Hüseyni nə üçün bimardır,
Laleyi-gül üzrə yatan iki fəttanın görün.

**91**

Çün cünun zəncirinə oldum giriftar, ey könül,
Olasan fərsudə canımdan xəbərdar ey könül.

Qaçsam ol zəncir ilə avaralıq səhrasına,
Qılma halımı xirəd əhlinə izhar, ey könül.

Qoy ki dövranın cəfa ayin eli bidadından,
Olmayın hərgiz olar içrə pədidar, ey könül.

Onda həm qoyma tapıb divanədir deb bağlayan,
Gər sürüb aparsalar xalqı sitəmkar, ey könül.

Qılsalar qovğa, ulus canıma bidad edəli,
Məndən ol dəm ləhzeyi ayrılma zinhar, ey könül.

Şayəd ol yanlığ tamaşa sarı məhvəşlər bilə,
Gələr ol şümşad qədd, mahi-rüxsar, ey könül.

Görgəc onu gər Hüseyni yanlığ istər tərki-huş,
Həzrətində qılasan canımı isar, ey könül.

**92**

Ah ilə əzm eylədim razimə məhrəm, yaxşı qal,
Dərd ilə ayrıldım, ey dərdimə mərhəm, yaxşı qal.

Xidmətində canü könlümü qoyub əzm eylədim,
Ey könül munisi, canıma həmdəm, yaxşı qal.

Gərçi hicranında qalmaz ruhi-cismimdən əsər,
Sən səlamət olgil, ey ruhi-mücəssəm, yaxşı qal.

Mən varıb, sən yar alnında qalarsan, ey könül,
Məni rüsva eylədin, rüsvayi-aləm, yaxşı qal.

Xeyri-badından Hüseyni tilbə olmuş ey pəri,
Deməsin yarına heç fərzəndi-adəm: yaxşı qal.

**93**

Eşqdən gəldi mənim başıma onca sə’b hal,
Kim onu Fərhad ilə Məcnun belə etməz xəyal.

Əql onun islahına hər necə kim, qıldı sətiz,
Leyk eşqim məngini qılmaq idi əmri-müxal.

Səbrü huşum mülkü oldu ortada yer bilə dəng,
Mən olub paymal, tapdı xanimanım ixtilal.

Kinə edib eşqü əqlim, səbrü huşum pozdular,
Vah ki, mən bixaniman, oldum arada paymal.

Düşdü ərkən ilə daği-eşqdən dərdi-bəla,
Mana düşənin minindən birisi yox ehtimal.

Ötməgil hüsn əhli köyü sarı, zinhar, ey rəfiq,
Gər inanmazsan mənim halıma baxıb ibrət al.

Ey Hüseyni, çün ərər namüdlük küfr, eylə sə’yi,
Kim nəsibin afyiət köyünü qılar zülcəlal.

**94**

Vah, nə işdir kimi kim, mən mehriban qıldım xəyal,
Özgələrdən ol məni köpräk qılar azarda hal.

Kimi kim, ondan məlalət dəfini mən gözlədim,
Ondan ox oldu baxıb durunca, vah, xatir məlal.

Onu kim, mən qılmadım azarda olğac söz çağı,
Qıldı ol azarda söz birlə məni tapğac məcal.

Kimi kim, mən istədim ola Məsiha tək fasih,
İstər ol kim, mən dəm urmaz olam alnında lal.

Neçə kim, vəsl istəsəm ol vəsl ara hicran dilər,
Ol dilər hicran, neçə hicran ötüb tapsam visal.

Ey Hüseyni, türfə halətdir bunu kimdən soraq,
Gəl yenə bir qatla həm ol yardan eylə sual.

**95**

Gülşən köyündən, ey can, rövzeyi-rizvan xəcil,
Üzü xəttin rəşkindən həm lalə, həm reyhan xəcil.

Övc gər tutdu, niyə girdi yenə topraq ara,
Olmayan olsa sirişkim bəhrindən tufan xəcil.

Nə üçün başın guyi salıb qızarmış, olmasa,
Gülüstan arizindən laleyi-nüman xəcil.

Bağ ara nə üçün güli-rə'na qızarar-saralar,
Gər onun ol üz gülündən qılmamış dövran xəcil.

Eşq dəşti üzrə Məcnundan uyalsam, eybi yox,
Gah olur huş əhlindən divaneyi-üryan xəcil.

Canı çox şövqündə yaxarsan, vəli fikr eylə kim,
Olmayasan yetsə nəyə vəsli, ey hicran, xəcil.

Sədəqəsi oldu Hüseyni, can dəxi qıldı fəda,
Olmadı yar alnında barı bu sərgərdan xəcil.

**96**

Ey könül, ol bivəfa köyündə məskən eyləgil,
Zar ağla, şərh edib halımı şivən eyləgil.

Necə olaram fəraqından xərab, ey gənci-hüsn,
Bir zaman viranə külbəmi müzəyyən eyləgil.

Sormagil kim, gül açılanmı ikən bostan ara,
Örpəyi al üzündənü aləmi gülşən eyləgil.

Zülfü zəngarını açıb cilvəsaz ol, ey sənəm,
Yüz tümən abidi hər sarı brəhmən eyləgil.

Ey Hüseyni, necə yaşırarsan ol ay mehrini,
Aqibət çün zahir etdin, indi rövşən eyləgil.

**~ 97 ~**

Necə bir baxmaq bilə könlümü xürsənd eyləgil,
Hicr tarın bir zaman vəslinə peyvənd eyləgil.

Uçmasın hürkünçlü  könlüm quşu, vah-vah onu,
Daneyi-xali-kəməndi-zülf ilə bənd eyləgil.

Bir acı söz birlə canımı qılıbsan təlxkəm,
Xəstə canımın əlacı bir şəkərxənd eyləgil.

Ya rəb, ol üzü iraq salma gözümdən, ta ona
Bunca güllər kim, açılmış, birin manənd eyləgil.

Yar cəbrindən vəfa üstünə gəlmiş, ey könül,
Qılmasın deb özgə onu əhdi-sövgənd eyləgil,

Təlmürüb qalan könül, fəhm eyləməz pəndimi heç,
Onu lütf eylə, təbiba, qəbuli-pənd eyləgil.

Ey Hüseyni, gər üzülsə könlün ol mehparədən,
Onu tiği-qət’ elə, pərkənd-pərkənd eyləgil.

**98**

Hicrin odu cismi-zarım qıldı kül, ey yar, bil,
Gər bina qılsan məzarım tərxin ol kül birlə qıl.

Qətl edib avara könlümü pozuq cismim ara,
Vah, bilib, bilməzə sal, ey can, gəlib nəzzarə qıl.

Ol qəddü üz hicrindən ölsəm, bəzə gülbərg ilə,
Torpağımın başı üzrə sərv əkib, mil eyləgil.

Eyləyərlər sə'b dərdim şərhindən izhari-əcz,
Olsa hər zəxmim ağız peykanın ol ağızda dil.

Gər yüzün olsa müdəvvər, sünbülün əsrü uzun,
Heç əməsdir, əcəb, nə üçün kim, ol aydır, bu il.

Ey səba, yetsən müsafir ayıma, zinhar kim,
Hicr zindanında onsuz tirə halımı degil.

Eşq canından olubsan, ey Hüseyni, əsrü məst,
Hüsndən gər bəhrə tapmaq istəsən bir dəm ayıl.

**99**

Kirpiyimdən, ey könül, hər dəm qanadlar saz qıl,
Hicr dəştindən visalı köyünə pərvaz qıl.

Mən niyaz əhli, düşmüşəm eşq ara, ey sərvinaz,
Hər neçə kim, mən niyaz etsəm, əyan sən naz qıl.

Qaibim halından, ey qasid, hekayət qılma, bəs,
Hər necə əncamına yetsən yenə ağaz qıl.

Eylədim, ey namə, razımı yazıb, ağzını möhr,
Yar əgər köksünü qılsa çak, şərhi-raz qıl.

Eşq edər şövqümü hər dəm köprəgü səbrimi az,
Gərçi sən bidadı çox, ya vəfanı az qıl.

Ey fələk, çün mən ona oldum yesir çoxdan bəri,
Türrəsin tərrar, yaxud qəmzəsin qəmmaz qıl.

Ey Hüseyni, könlü çün bülbül kimi qıldın həva,
Barı ol güli-gülşən köyünü ox əndaz qıl.

**~ 100 ~**

Bu sazı fənnində qıldı səhər kamil,
Bu fənninə səzavardır əsrü şamil.

Biz uş çöldən gəlmişiz, acıb-arıb,
Bizim tək olmaya aləmdə sail.

Gəl indi, saqiyi-gülçöhrə məhvəş,
Qolunu boynuma qılgil həmaıl.

Bizim pəhrizimizi bildi xublar,
Onun üçün bizə olmadı mail.

Hərinin[1] xublarına oldu rəmzi,
Hüseyni, sözlərindən olma qafil.

---

[1] Həri – Herat şəhərin başqa bir adı.

## 101

Mən xələl oldum qəmindən, sən quyaşsan, ey sənəm,
Yox əcəb, gər olsa məndən kəmliyü səndən kərəm.

Bağ ara xəşək yeldən hər tərəf meyl eyləsə,
Sayəsini eyləməz başından onun sərv kəm.

Çün qəmü fəryadü əfğanı ərər gül şövqündən,
Hər nihal üzrə əgər bülbül nəva çəkər, nə qəm.

Hər yana seyr etsə pərvanə şəbistan səhnində,
Var bu rövşən kim, çəkər şəm’ odu könlündən ələm.

Gözü zülfün birlə ağzın sirrin yayar can ara,
Gər Hüseyni dərdi-eşqin yolunda olsa adəm.

**102**

Vah ki, eşqim şö'ləsi hər dəm çəkər andağ aləm,
Kim məlayik gözü dudindən olar hər ləhzə nəm.

Zə'fərani-arizim lövhündə, vah, şənrəf ilə,
Şərhi-hicrin yazalı hər kirpiyindir bir qələm.

Ta əlif tək qəddi-lamı zülfü ağzın mimindən,
Ayrıyam, vah, görmədim hicranından qeyr əz ələm.

Katibi-təqdir elə guya ki, eyşi-nəşat,
Qismət edəndə mana dərdü bəla qıldı rəqəm.

Ey Hüseyni, eşq oxu kim, sınsa peyvənd edəli,
Kirpiyim qan-yaş aradır abnus ilə baxam.

**103**

Necə yanar hicr ilə fərsudə canım dəmbədəm,
Hicrdən könlümə yüz qəm, qəm üzə dərdi-ələm.

Yar vardı gözdənü könlümdə firqət şiddəti,
Çərx bidad eylədi canıma, dövran cəbr həm.

Gecə-gündüz canıma, vah kim, bəlalar üz qoyub,
Şam ta sübh uyğu yoxdan könlümə yüz min sitəm.

Hicr ara səbrim yoxü, ənduh ara çox müztərib
Əşkdən seyli-bəla, ah odundan hər dəm aləm.

Barça bir sarıyü yoxdur yar vəslindən ümid,
Taparsan vəsl, ey könül, ol dəm ki olarsan adəm.

Çün könül üzdü cahından dəhr gülzarın qoyub,
Qıl onun mə'vasını, ya rəb ki, gülzari-İrəm.

Ey Hüseyni, matəmim şərhini dedim, kim yaza,
Suzindən həm səhifə od düşdü, həm yandı qələm.

## 104

Hanı bir məhvəş, ona suzü güdazımı desəm,
Hanı bir müşfiq ki, bir dəm ona razımı desəm.

Anlayalar kim, həqiqət sirrindən xali iməs,
El ara keyfiyyəti-eşqi-məcazımı desəm.

Yeddi çərx övraqı dolar, yeddi bəhr olsa mədad,
Bir zamanlıq hicr ara suzi-güdazımı desəm.

Dəhr ara aşub çox düşər, səlamət qalar az,
Dərdi-səbrim şərhi içrə çoxumu-azımı desəm.

Vah, necə kim, nazi-istiğnasın eylər birə yüz,
Hər necə kim, nöqteyi-əczi-niyazımı desəm.

Gözə tər damədir, onu necə ucuz deyim,
Könül adlı sadə rind pakbazımı desəm.

Duzəx olsun məskənim, gər tubeyi-cənnət sözü
Ötsə, onun ötrüsündə sərvi-nazımı desəm.

Köyməyən pərvanəyəm, tək qalmaya hicran tünü,
Bəzm ara gər ləme’yi-şəm’i-tərrazımı desəm.

Ey Hüseyni, el səlamət köyündən olar cəla,
Gər Nəvai yanlığ ahəngi-Hicazımı desəm.

## 105

Tapmadım bir müşfiqi kim, halı-zarımı desəm,
Yaxud ol güldən içimdə xari-xarımı desəm.

Dəşt olar laləzarından uyatlıq hicr ara,
Bunca qanlı dağ ilə cismi-nəzarımı  desəm.

Çərxü əncüm meyvəsi birlə desə mərhəm qoyaq,
Aciz olar şiddəti-cismi fəqarımı desəm.

Aləm əhlinə cahan olar qaranğu, şəmməyi
Zülfi-hicrindən qaralan rüzgarımı desəm.

Sayədən özgə kişim yoxdur yanımda, ey quyaş,
Qəm tünü yalnızlığımda qəmgüsarımı desəm.

Saqiya, mey tut ki, könlün ağrıyar gər yarın
Cani-vəsli-şövqündən mühlik xumarımı desəm.

Ey Hüseyni, çün vəfa əhlinə yoxdur cüz’ cəfa,
Həm cəfa eylər vəfayi-bişümarımı desəm.

## 106

Zar olaram ol pəri yox kim, xəbərdar eyləsəm,
Cilvə qılğac alnında gözü gövhərbar eyləsəm.

Öylə kim, ol qəmzə bağrım qanından aşam edər,
İstərəm könlümü lə’lindən ciyərxar eyləsəm.

Tün-gün ol gül çün cəfa eylər, nə qəm, könlüm quşun,
Köyündə bülbül kimi şamü səhər zar eyləsəm.

Nə ərər Leyliyü Şirindən sana, pəs mən dəxi
Eyb iməs Fərhadü Məcnundan əgər ar eyləsəm.

Bu ki sürtər mən sarı üzün atın toynağına,
İstərəm, vah kim, onun nalını zərgər eyləsəm.

Ötmə səğər dövründən kim, yox bəcüz sərgəştəlik,
Hər necə nəzzareyi bu dövri-peykar eyləsəm.

Ey Hüseyni, yarsızlıq həm ərər xoş aləmi,
Çünki canım qəsdi eylər meyli hər yar eyləsəm.

### ꕥ 107 ꕥ

Qəddi-üzün hicrindən, vah kim, mana olmuş müdam
Sərvi-meyli bərtərəf, gül arzusu xud haram.

Gözümə hər kirpik olsun bir tikan, gər sənsizin
İstəyib gül gəştini bostan ara qılsam xuram.

Dəşt üzə yüz laleyi-yaqutun vardır mana,
Hicr xunabın tutana çün gərəklik olsa cam.

Vah, nə gün ola ki, bağ içrə düzübən bəzmi-eyş,
Qılsa ol sərvi-rəvan göz gülşəni içrə xuram.

Hicr ara qalan Hüseynidən, səba yetsən degil,
Mehriban sərvi-güləndamıma çoxdan-çox salam.

**108**

Həddən aşdı eşqin odu içrə dərdi-həsrətim,
Vay kim, sən qafili yandırdı daği-firqətim.

Der idim hicrin odu suzinə qalsam ölərəm,
Yandırar bu qüssədən canımı hər dəm heyrətim.

Mən varıb, qalmış visalın bağı içrə can quşu,
Od yaxar balını yandırmağa, vah kim, qeyrətim.

Dərdü rəncü möhnətü qəmə təhəmmül eylədim,
Səndən ayrı olalı, billah ki, yoxdur taqətim.

Ey Hüseyni, ol quyaşın firqətinə düşəli,
Yox dürur huri-pərinin vəsli birlə ülfətim.

**109**

Necə olar vəslin ümidinə dərdi-həsrətim,
Rəhm qıl kim, yox dürur hicrində indi taqətim.

İştiyaqın munisim, şövqün hərifi-məclisim,
Dərdi-eşqin həmdəmim, rəncü qəmin həm söhbətim.

Səndə yox mehrü mana, yox səndən üzməyə könül,
Vaqeən vardır bu iki müşkül işdə heyrətim.

Can içində yaşırın tutdum qəmini müddəti,
Mərhəmət qıla ki, bundan narı yoxdur qüvvətim.

Ey Hüseyni, lə’linə ta diş qıcadım, yox dürur
Çeşmeyi-heyvan bilə kövsər suyuna rəğbətim.

**110**

Sən qəmim bilmə, xəyalın birlə vardır heyrətim,
Bildiyini anlasam, bilməm nə olar halətim.

Vay kim, yüz qatla qılar ərdim öz eşqimi faş,
Vah ki, el adını zikr edəndən artar qeyrətim.

«Elə məzkur olar adın» deb həsəd mane olar,
Yoxsa tutar ərdi eşqində cahanı şöhrətim.

Özgə dəmə salmagil öldürməyimi, ey Məsih,
Vəhm edərəm verməyə ömr özgə dəmə möhlətim.

Ey Hüseyni, namə yazanda öpəm deb adını,
Bu həvəs birlə qələm yanlığ olubdur hey'ətim.

**111**

Atəşin xəl’ət demə cismim üzə ey dilbərim,
Kim ərər eşqin odu birlə tutuşan peykərim.

Ya ərər simabi deb qılma güman kim, eşq odu
Örtədi məcruh cismimi, ərər xakistərim.

Demə əhgər tək libasın üzrə var simabi don,
Kül durur simabisiyü, atəşindir əhgərim.

Zinət üçün demə: var cismində gunəgün libas,
Eşq yaxıb sərbəsər qılmış, bu zibü zivərim.

Uçar ərdim hər zaman, əz bəs ki, dəymiş navəkin,
Olmasa ərdi əgər peykanlarından ləngərim.

Köyündə xişti ki, bir gün qoymuşam baş altına,
Eyləyin zinhar çün ölsəm ləhəddə bəstərim.

Ey Hüseyni, olmuşam zühdi-riayindən xilas,
Olalı muğ köyü sarı der piri-rəhbərim.

## 112

Qılan ərmiş ol pəri tərki-məhəbbət, bilmədim,
Düşən ərmiş cavidan könlümə firqət, bilmədim.

Mən ona canı fəda qılmaqdayü ol canıma
Hicr odu yaxmış, qoyara daği-həsrət, bilmədim.

Aşiq olanda ümidim var idi nuşi-nəşat,
Onda var ərkəni bunca nişi-möhnət, bilmədim.

Şö'leyi-şövqün yarutdum, vah ki, məhzun canıma
Hər bir uçqun olmağın bir bərqi-afət, bilmədim.

Vəsl ümidi birlə eşq asan göründü, vay kim,
Onda hər dəm var ikəni bunca şiddət, bilmədim.

Mübtəla olanda ol kafirə, qıldım tərki-can,
Bir yolu bərbad oları dinü millət, bilmədim.

Ey Hüseyni, eşqi qıldım nihan, qalmaq güman,
Bunca rüsvalıq bilə tutmağı şöhrət, bilmədim.

## ❧ 113 ☙

Seyli-əşkim pozdu səbrim külbəsin bünyadından,
Vah, nələr gəldi başıma, ol pərivəş yadından.

Seyli-əşkim kükrədi üşşaqçı bünyadından,
Hər haçan kim növhə düzdüm ol pərivəş yadından.

Baxsa ol ay eşqində Leyliyü Şirin halıma,
Qılmayarlar yad: ol Məcnunu, bu Fərhadından.

Ol gözü qatildən öldürməyi öyrənmiş əcəl,
Leyk təhsin tapmaz ol şagird bu ustadından.

Səyd ərər könlüm quşu ol üzəyü istər onu,
Böylə quş kim gördü kim, rəm qılmaya səyyadından.

Bizə adət eşq olubdur, ol sənəmə cəbri-naz,
Mümkün ərməs hər kişiyə ötmək öz mötadından.

Saqiya, tut bir qədəh kim, badənin dadın verək,
Kim bəsi xunab içib mən dövr eli bidadından.

Ey Hüseyni, zülm görən xatirim viran olar,
Çəksə hər məzlum ahı xatiri-naşadından.

**114**

Ləblərindən söz eşitsəm şəkəristanmı deyəyin,
Hər haçan qılsan təbəssüm lə'li-xəndanmı deyəyin.

Lə'li-canbəxşindən, ey arami-can, tapdım həyat,
Bilməm onu canfəza söyləyək, ya canmı deyəyin.

Arizini gülmü, de, müşkin xəttini xətti-mehr,
Ya bunu müshafmı, onu xəttı-reyhanmı deyəyin.

Belinin tarınmı sordun, yoxsa lə'lindən onun,
Rişteyi-canmı deyəyin, ya abi-heyvanmı deyəyin.

Cənnət içrə sakin olsan, tubyi-cənnətmi, de,
Cilvə qılğac qamətin, sərvi-xuramanmı, deyəyin.

«Özgə sarı baxma» deb gözümə qoydun daği-möhr,
Göz qarasımı deyəyin, ya daği-hicranmı deyəyin.

Qulluğuna xətt verib, aləmi-azad eylədim,
Uşbu mənada özümü qulmu, sultanmı deyəyin.

Qönçə ağzının xəyalı könlüm içrədir nihan,
Natəvan cismimdə peykan içrə peykanmı deyəyin.

Lə'lindən canım adəm olduyü, könlüm türfərək,
Qönçə ağzı firqətində təbtə qanmı, deyəyin.

Ey Hüseyni, çak edib köksümü tikmiş lütf ilə,
Tikməyin mərhəmmi, dərman üzrə dərmanmı deyəyin.

## ❧ 115 ☙

Tiğ ilə könlümü qıldın zəxm, ey simin bədən,
Qanı durmazdır deyib ol zəxm üzrə qoydurdun düyün.

Yüz tikan tək iynə birlə, vay kim, zəxm eylədin,
Hicr ara zəxmin ayağına giribdir der tikan.

Heyf deb hayqırmagil, cana, nə xeyr indi kim,
Dərdi-hicrindən adəm sərmənzilin qıldım vətən.

Ey ki, yapdın könlümə səbrü səlamət pərdəsin,
Pərdeyi-səbr ərməs ərmiş, ol ki var ərmiş kəfən.

Cana yar od yaxsa, mərhəm yaxanınca şad ol,
Ey Hüseyni, eşq ara bu növ' ərər vəchi-hüsn.

## 116

Yox dəmi, kim tilbələr tək ol pəriyə zar imən,
Səbrü huşumdan cüda dərdi-bəlaya yar imən.

Bəstəri-zə’fimdə görsən, şərbət əzmə, ey təbib,
Kim, ölmüşəm hicri-dərdi-rəncindən bimar imən.

Lə’li-canım almağından öylə mən xoşhal kim,
İsayü Məryəm əgər can versə minnətdar imən.

Ey quyaş, girdin düşümə çün göz açdım, yox idin,
Gəl yenə tanrı üçün göz yumdumü bidar imən.

Cismimə yaxan bəla daşını görgəc, biləsən –
Kim, məni uryan güli-nəsrin deyib əfgar imən.

Eşq ara əql afətin çün bilmişəm, ey müğbeçə,
Eyb qılma gər dəmi bu deyr ara huşyar imən.

Ey Hüseyni, ta ki, deb mən ol üzü ləb vəsfini,
De şirin nütuq imənmi, yoxsa xoş güftar imən.

## ☙ 117 ❧

Ey visalın xəstə könlüm mərhəmi, arami-can,
Ölmədim hicran əlindən, mən qatı canlı yaman.

Dərd ilə hər dəm saçaram lə’li-əşk yerində,
İki aləm içrə yoxdur gözlərim tək bəhrü kan.

Gər fəraqın möhnəti budur mən biçarəyə,
Tapmayasan bu məni-dilxəstədən nami-nişan.

Hər haçan çıxsan xuraman, qəddü ağzını görüb,
Ah birlə dəng çıxar ol dəm bədəndən uşbu can.

Aqibət, bir gün Hüseynini cəfa tiği bilə
Qətl qılaram dedin, ey dost, bismilla, rəvan.

### ❧ 118 ☙

Ey sənin qaşü gözün sərfitneyi-axırzaman,
Ləblərindir xəstə könlümə həyati-cavidan.

Ey quyaş üzlü sənəm, halım görüb rəhm eylə kim,
Yetdi göyə hər nəfəs hicrində fəryadü fəğan.

El arasında necə sirrimi pünhan saxladım,
Bu sarı üz aşikarə eylədi razi-nihan.

Gər xəyalın olsa mehman könlüm öyündə dəmi,
Eyləyər üz sarı hər dəm gözlərim gövhər fəşan.

Dedim: ey can, dərdimə vəslin bilə bir çarə qıl,
Gülüb dedi: ey Hüseyni, tutma məndən bu güman.

## ⁂ 119 ⁂

Səbzeyi-xəttin içində öylə kim candır nihan,
Hoqqayi-lə'lin ara həm dürri-qaltandır nihan.

Mehr ondağ kim, bulud içrə nihan qılar özün,
Sünbüli-zülfün içində mahi-tabandır nihan.

Ol pəri könlümdə, ey əql, ol tərəf aylanma kim,
Onda bir eldən yaşırğan türfə mehmandır nihan.

Sorma peydayü nihanım kim, həzin könlüm ara,
Niçə ox kim, olsa peyda, onca peykandır nihan.

Məş'əli-vəslindən, ey eşq, el gözün yarutmagil,
Şəm'i-rüxsarını könlüm öyündə yandır nihan.

Nar tək könlümü edib çak, mə'lum eylə kim,
Köksüm içrə qətrə-qətrə bağlayan qandır nihan.

Yolda yaşınmış Hüseyni deməyin, dayanmasın,
Bilsə bu kim, yol ara bir zari-heyrandır nihan.

## 120

Zülfü içrə bel, xətti içrə lə'li xəndandır nihan,
Öylə kim, candır nihan, həm rişteyi-candır nihan.

Demə eşqimdən nə israf sən nihan köksün ara,
Onda hər yan nöqt yanlığ daği-hicrandır nihan.

Öldürər qeyrət ki, görsə el gözü deb necə kim,
Tən ara candır nihan, can içrə canandır nihan.

Ey ki, dersən eşq sirrin zari-könlündə yaşır,
Şö'ləni xəşək ara qılmaq nə imkandır nihan.

Ey müsəlmanlar, könül meyl etməsə taət sarı,
Eyb qılman onda çün bir namüsəlmandır nihan.

Aşikarədir ayağın salma əldən ləhzəyə,
Nə üçün kim, el gözüdən zari-dövrandır nihan.

Həm Hüseyni ruzigari tirədir, həm gözləri,
Guya ki, bəzmindən ol xurşid rəxşandır nihan.

### ☙ 121 ❧

Zülfü içrə xətt, xətt içrə lə’li-xəndandır nihan,
Zülmət içrə Xızır həm, həm abi-heyvandır nihan.

Səhər birlə fitnədən xali iməs könlüm dəmi,
Onda çün bir gözü sehr, xalı fəttandır nihan.

Könlüm içrə kim nihandır deməyin, ey dostlar,
Kim nihan olar könüldə, könlüm alandır nihan.

Qönçə ağzı nəqşimi könlümdədir, ya tən ara,
Çox xədəngindənmi peykan içrə peykandır nihan.

Olsa könlümdə səfayü nur, ərməsdir əcəb,
Onda ol üz şövqündən xurşidi-rəxşandır nihan.

Eşqi-suzin zari-cismimdə niçin pünhan tutaq,
Bərq odu xəşək ara olmaq naimkandır nihan.

Ey Hüseyn köyməyincə eşq ara yetməs visal,
Təni köydür aşikarə, canı həm yandır nihan.

## ☙ 122 ❧

Zülfü içrə gül, gül içrə lə'li-xəndandır nihan,
Donda mehru, mehr ara sərçeşmeyi-candır nihan.

Tirə könlüm içrə canpərvər ləbin pünhanlığı,
Zülmət içrə ol sifət kim, abi-heyvandır nihan.

Qönçə içrə öylə kim, hər yan nihan olar tikan,
Hicr oxundan könlüm içrə onca peykandır nihan.

Əhli-din içrə müsəlmanlar nedib peyda olaq –
Kim, pozuq könlüm ara bir namüsəlmandır nihan.

Sorma suzi birlə əfğanın ha yan pünhan ərər,
Canım içrə suzi, könlüm içrə əfğandır nihan.

Dövr ayağın, saqiya, bir dəm əlindən salma kim,
Könlüm içrə bir neçə ənduhi-dövrandır nihan.

Gər Hüseyni söyləyəndə ah çəkdi, şükür kim,
Qeyrindən dud içrə ol xurşidi-rəxşandır nihan.

## ☙ 123 ❧

Ol quyaş kim, ay üzünün dövründə gümüş qıran,
Barça məhvəşlər arasında ərər sahibgiran.

Örpəyidir kəhkəşan, əncumdür onun incisi,
Görmədi yüz göz bilə gərdun bunun tək bir giran.

İncindən ol şəttadır, kim eylədin paymal onu,
Ya sürəyyadır ayağın öpəli gəlmiş rəvan.

Gül üzün gərdində tirgən incilər ərməs ki var,
Qətrə güllər yaprağı üstündə şəbnəmdən əyan.

Var ikən ol mah cəbin üzündə tirin kəsrəti,
Ya qəmər ətrafında görkəzdi əncümdən nişan.

Görgəc ol məhvəş giranın, gözlərim tökdü sirişk,
Var yəqin yağmaq əcəb ay halə bağlayan zaman.

Ey Hüseyni, yeddi kövkəbdə təmənna var bu kim,
Titrədiçi başına tapalar inci tək məkan.

## ❧ 124 ☙

Göz yaşımdır firqətində yüz üzə dürlü xəzan,
Rəhm qıl, ey ərğüvani rəng donlu növcəvan.

Qönçə ağzın, gül üzün, tuba qəddin, səbzə xəttin,
Olmasın, ya rəb, bunun tək hüsnünə hərgiz xəzan.

Dərdi-ahımı şərarlar birlə görənlər bilib
Deyər ki, yetdi hicr dəştindən yüz odlu karvan.

Ol iki gözdürmü, ya vəslin dilər, vah, zə’fdən,
Guşeyi-hicran ara yatmış bu iki natəvan.

Bir pəri eşqində mən tək olsa rüsva, eyb iməs,
Sirrini Məcnun bilə Fərhaddan yaşırmayan.

Düşmənimdən nə bəlalar yetdi məhzun canıma,
Dostlar həm, vah ki, bu məhzuna eylər qəsdi-can.

Vardılar əhbabü mən hicran yesiri olmuşam,
İt uyub qalmış dəxi, vah kim, göçübdür karvan.

Saqiya, canım fədan olsun, tutub ver cami-mey,
Vah ki, hicran dərdindən canımı qurtar bir zaman.

Eşq Qafı altında qalan Hüseyni toprağın,
Necə can çəkib çıxaralar onu əhli-cahan.

## 125

Vah ki, bir qatilə andağ zarü heyranam bu gün –
Kim, gözü, zülfü kimi məsti-pərişanam bu gün.

Duzəx əhli köyməyinizdən mənim alnımda çox,
Deməyin kim, mübtəlayi-dağı-hicranam bu gün.

Bəs ki, ətfal atdı daş, suzi-hicran urdu od,
Lalə tək başdan-ayaga dağ ilə qanam bu gün.

İstər ərdim, vah, həyatımı onun vəsli üçün,
Dərdi-hicrindən həyatımdan peşimanam bu gün.

Soralı gəldin bu gün danla, demə qılam vida,
Zari-könlümü riayət qıl ki, mehmanam bu gün.

İstəmə abad, deyib pənd, ey naseh, məni,
Kim biri seyli-qəmindən əsrü viranam bu gün.

Ey Hüseyni, başım üzrə çətr təkdir dudi-ah,
Şək iməs kim dərdi-eşq əhlinə sultanam bu gün.

**126**

Ol quyaş kim, çərx ara aşüftə pərçəmdir bu gün,
Xəstə könlüm zülfi-tabı içrə dərhəmdir bu gün.

Sorma köyündən, əgər əfğan qılaram hər gecə –
Kim, mənim tək aşiqi-bixaniman kəmdir bu gün.

Ol vəfasızdan cəfalar gördümü dəm urmadım –
Kim, mana aşiqlik ayini-müsəlləmdir bu gün.

Heyli-qəm canıma qəsd eylər idi, ey əqlü huş,
Çün mədəd oldu mana eşq, özgə nə qəmdir bu gün.

Can verib öpdüm ayağın sabit eylər eşq ona,
Mən kimi bir aşiqi-sabitqədəm kəmdir bu gün.

Kim gədayın olsa aləmdən kecib, ey dilrüba,
Fəqir əhli içrə ol sultani-aləmdir bu gün.

Sormayın miskin Hüseyni halını, ey əhli-huş –
Kim filani-eşqindən rüsvayi-aləmdir bu gün.

**☙ 127 ❧**

Səni görgəc der idim: çıxar fəğan candan burun,
Çıxmasın deb rəşkindən can çıxdı əfğandan burun.

Nameyi-şövqüm başına yazmasam adın, nə eyb,
El gözü düşməz çü məzmununa ünvandan burun.

Əvvəl ol yüz cilvə qıldı, sonra zahir oldu xətt,
Gül zühurun, ey könül kim, gördü reyhandan burun.

Sormağıma kim gələr ol ay xədəngin çəkməyin,
Çıxmaya can ta ki, ol gəlincə peykandan burun.

Vah, nə halətdir ki, yüz şümşad qədd çıxsa, biri
Uçramaz gözümə ol sərvi-xuramandan burun.

Rəhm qıl kim, var ikəndir aşiqü məşuq həm,
Mən gədayi-dəhr, sən aşubi-dövrandan burun.

Demə kim, eşqi əzəldən qismət olmuş canıma,
Ey Hüseyni, bu nəsib olmuş mana ondan burun.

**☙ 128 ❧**

Vəsl ara öldür məni hicran cəfasından burun,
Necə kim, qılsan xilas onun bəlasından burun.

Könlümə qəmdən burun xunab içirdi dərdi-eşq,
Xəstəyə şərbət içirən tək qəzasından burun.

Fariq ol, ey müddəi, məndən ki, görgəc yarı
Heç kamım yoxdur ölmək müddəasından burun.

Aşiq olmam mən bu gün, ey şeyx kim, canafərin,
Qismim etdi afəriniş ibtidasından burun.

Ey Məsiha, urma dəm kim, abi-heyvan zəhərdir,
Natəvan könlümə vəslinin ədasından burun.

Öylə yetdim cana hicrindən ki, gər tapsam visal,
Sormayam mən xəstə, hicran macərasından burun.

Ey Hüseyni, gər budur nalən eyb ərməs yara,
Gər yetər üşşaqi-bisaman nəvasından burun.

**129**

Sərvi-qəddin yadından naləm böyük, könlüm həzin,
Gül üzünün həsrətindən isti ahım atəşin.

Ahi-hicrin həmnəfəs, ənduhi-şövqün həmvəsəq,
Yadi-vəslin həmsəfər, dərdi-fəraqın həmnişin.

Vah, hanı ol gün ki, hər dəm lə'l üzə xalın görüb,
Deyər ərdim örtənib şövqündə mən zari-qəmin.

Nöqtədir ya xali-müşkin ol ləbi-meygün üzə,
Ya ona oxşar ki, qonar şəkər üstündə çibin.

Yar vəslidir Hüseyninin muradı dünyada,
Sən muradına yetirgil, ya ilahil-aləmin.

**130**

Gözlərim kor et, qəza, bir şəkli-mövzun görməyim,
Özüm bir Leyliveşi eşqində Məcnun görməyim.

Eşq ara avara qıl fərsudə canım, ey əcəl,
Dostlar könlünü öz halıma məhzun görməyim.

Şövqündən şeydalığım şərhi yetib ol yerə kim,
Dedi: mən sərgəşteyi-rüsvanı Məcnun görməyim.

Ey xirəd, ol gül qəmin məhv et könüldən, ta yenə
Əşki-qanı birlə rüxsarımı gülgün görməyim.

Bir ərəb birlə əcəm aşubu söymə kim, yenə
Bu gözüm əşkin Fərat, ol birin Ceyhun görməyim.

Gözləri pozdu könül mülkün bu yanlığ türktaz,
Çün yetişdi olmaz, ol kişvəri xamun görməyim.

Eşqdən qurtar məni, ey çərx kim, hər qəm tünü
Hicr şamı heylindən yüz min şəbixun görməyim.

Saqiya, tutgil dolu gərdun kimi sağəri kim,
Canıma derəm: dəmi-bidadi-gərdun görməyim.

Görmə derlər ol pərivəşi ki, eylər qəsdi-can,
Ey Hüseyni, bu müyəssər olsa nə üçün görməyim.

**131**

Vəsl ara öldür məni, ta daği-hicran görməyim,
Yandır andağ dağ ilə kim, heç dərman görməyim.

Ey əcəl, hüsnünə heyran ikən canımı al,
Ta özümdən özgəni ol üzə heyran görməyim.

Çəkməgil, ah, ey könül kim, aləm əhli qətlinə
Səbzəsin gül üzrə ol yeldən pərişan görməyim.

Ol üzü qədd hicrində bostana qılmam meyl kim,
Gül sarı göz salmayıb sərvi-xuraman görməyim.

Gərçi qanımı qurutdu hicr odu, həm xoş durar
Qətl vəqti varı onun tiğində qan görməyim.

Saqiya, əvvəl məni bəzm içrə bihuş eylə kim,
İltifatın məclis əhli sarı hər yan görməyim.

Ey Hüseyni, hicr ara səbr eyləgil kim, əhli-eşq
Vəsl tapmaq mümkün ərməs, dərdi-hicran görməyim.

## 132

Bir pərivəş eşqindən andağ pərişan hal mən –
Kim, onun şərhin qılandan əsrü günü lal mən.

Zülfünün sevdası andağ könlüm içrə düşdü kim,
Ol qara qayğında zülfündən pərişan hal mən.

Xatirim xoşdur, ayağını öpər meydan ara,
Gərçi zülfü tək ayağı altında paymal mən.

Muyindən, beli-xəyalından tənim andağ ki mu,
Nalədən, zülfi-həvəsindən niçin kim nal mən.

Ol əlif kim, iki nunu eyn arasında çəkər,
Gər əlif ərdi qəddim, indi qəmindən dal mən.

Ənbərin xalın qəmindən, görgül, ey gözü qara,
Kim qara bəxtim kimi eşq əhli içrə xal mən.

Ey səba, yar alnında ərz et Hüseyni halını –
Kim, qəmi-eşqi ara zarü xərab əhval mən.

## 133

Köydü bu məhzun könül, aləm qaraldı dudindən,
Qəhri-lütf ayin bilə lütfi-itab aludindən.

Qətlim onun qəsdiyü, vəsli könül məqsudidir,
Qəsd ona bu növ' isə aləm kecər məqsudindən.

Eşq sud birlə tənimə girdi, çıxar can bilə,
Naseha, mən' etmə eli adəti-məxudindən.

Yetəli sərmayeyi-eşqin məni-sevdayiyə,
Fariq olmuş xatirim, aləm ziyanü sudindən.

Səndə zühdü məndə üsyan, nə təfavüt, ey fəqih,
Heç kim çün vaqif ərməs axır iş behbudindən.

Ey münəccim deməgil kim, ay tutulmuş bu gecə –
Kim, örtülmüş bir quyaş hicrində ahım dudindən.

Ey Hüseyni, demə səbr etsən nəticə vəsl ərər –
Kim, nəticə istəmiş bir fe'li-namövcudindən.

## 134

Gər gəlib viranə qəbrimi ziyarət qılasan,
Rəhm edib, ey qatilim, onu imarət qılasan.

Qətl ara təslim ərər, ey hicri-alnında əcəl,
Necə alıb canım izhari-məharət qılasan.

Çün könüldə qoymadın aramü səbrü əqlü din,
İndi, ey zalım, bu kişvərdə nə qarət qılasan.

Ahım alnında soyuq-sərinsən, ey duzəx odu,
Hər dəm yer yüz qatla izhari-hərarət qılasan.

Ol ay istiğnasından əflak ərər pəs, ey könül,
Hacət ərməsdir ki, sən ərzi-həqarət qılasan.

Necə el qətlinə məmur eyləbən ol qəmzəni -
Yaşırın, leykin mənim sarı işarət qılasan.

Ey Hüseyni, eşqdən keçim ki, mühlikdir dedin,
Yaxşıraq,  gər indi təğyir ibarət qılasan.

### ~ 135 ~

Gəlsə ol gülçöhrə süsən tək, deməkdən lal mən,
Gəlməsə badi-səba tək hicrindən bihal mən.

Hicrin oxu kəsrətindən pər çıxardım, ey pəri,
Handa kim, varsan sana yetməkdə fariqbal mən.

Dərdi-hicrindən işim rəqim qələm tək nalədir,
Zə'flik bican tənim birlə niçin kim, nal mən.

Yusifim hicrində ömrümdən doyub mən, ey Məsih,
Var ölüncə barça gər xud Nuh ilə həmsal mən.

Ol quyaşın vəslindən pərtöv haçan düşsə mana,
Aləm içrə sə'di-kövkəb tək hümayun pal mən.

Xanəgah şeyxi dəmadəm pənd vermək, nə asığ,
Mən ki deyr içrə xərab, cani-malamal mən.

Ey Hüseyni, ol əlif tək qədd-qəmindən peykərim –
Kim, əyildi qəm yükün çəkməyə, guya dal mən.

## ☙ 136 ❧

Zülfi-hicrindən pərişan hali-zarımmı ikən,
Hicr şamı tək qaralan ruzigarımmı ikən.

Səngi-baran qəzadanmı ikən məcruhi-mur,
Ya fəraq asibindən cismi fəğarımmı ikən.

Ol quyaşdan ayrı hicran şamı əncüm heyli tək,
Ah odundan göyə üzlənən şərarımmı ikən.

Kirpiyindənmi ikən könlüm ara hər sarı niş,
Yaxud ol güldən ürəkdə xari-xarımmı ikən.

Səyridib meydan ara girgəc ulusu yandıran,
Bərqi-ləm’əmi ikən, ya şahsüvarımmı ikən.

Saqiya, mey tut ki, bilməm qəsdim edən qəm tünü,
Firqəti-qatilmi, ya mühlik xumarımmı ikən.

Ey Hüseyni, tazə güllərmi ikən gülşən ara,
Ya çəmən gülgəştin eylər gülüzarımmı ikən.

### 137

Eşq ara heç kim mənim tək zarü şeyda olmasın,
Olsa həm, vah, mən kimi məhcurü rüsva olmasın.

Heç kişi eşq içrə mən tək olmasın könlü şikəst,
Əhli-hüsn içrə sənin tək könlü xara olmasın.

Cəbrü bidadını mühlik, istərəm canıma kim,
Heç kimə eşqi ol ayın təmənna olmasın.

Bir zaman görməyə ol arizi yoxdur taqətim,
Eşq ara heç kim mənim tək naşəkiba olmasın.

Xəstə könlüm rəşkindən bihal mən, ol köy ara,
İtiniz mən onda ərkən çağda peyda olmasın.

Köyündə şeyda könül fəryad qılma bəd əz in,
Gecə, ya gündüz uyur vəqtində qovğa olmasın.

Yar müstəğnidir andağ kim, qaşında dəng durar,
Gər Hüseyni, olsa onun alnında ya(y) olmasın.

**138**

Yarsız məhzun könül divanə olmaz neyləsin,
Vamiqü Məcnun kimi əfsanə olmaz neyləsin.

Dərdi-qəmdən çarə yox hicrində onsuz xəstə can,
Qəmə həmdəm, dərdə həmxanə olmaz neyləsin.

Eşq tufanıyü mey seylabı bir dəm əksilməz,
Ey könül, ömrüm öyü viranə olmaz neyləsin.

Arizi-gülşən ara güldür, şəbistan içrə şəm’,
Gah bu həm bülbül, gahi pərvanə olmaz neyləsin.

Can alanda çün ərər mərdanə ol ay, can dəxi
Özünü edəndə fəda mərdanə olmaz neyləsin.

Çün olar hər ləhzə bir biganə birlə aşina,
Aşinalardan könül biganə olmaz neyləsin.

Tilbəgər olmuş Hüseyni, eybi yox, yarı onun
Çün pəri olmuş, özü divanə olmaz neyləsin.

**139**

Səbrsiz könlümə baxsam, artadır eşqu-cünun,
Natəvan canımı görsəm şövq ilə dərdi füzun.

Oxlarından könlüm öyünə sütunlar qoymuşam,
Cism öyünə rast ondağ kim əsadandır sütün.

Bəs ki, peykanın tənimdə qaldı qəddim oldu xəm,
Şaxında çün meyvə çox olsa qəddin eylər nəgun.

Əymə qaşın həyatı bimar olan göz üzə,
Var onun tək kim, beayna natəvan üstündə nun.

Bərgi-gül hümrət bilən lə'lincə olmaz öylə kim,
Badə olmaz suyu gərçi eyləyərlər lə'lgun.

Dəhr bostanında hər kim sərv tək azadədir,
Olmaz özgə nəxllər yanlığ xəzan yetgəc zəbun.

Ey Hüseyni, ta ki mümkündür cahanda kam sür,
Aqibət nakamlıq yetirəcək çün çərxi-dun.

## ❧ 140 ❧

Növbahar əyyamı bülbül tək neçün çəkməz fəğan,
Güllənən çağda nihali-növrəsim qılmış xəzan.

Zə’fərani-əşk sarı çöhrəm üzrə, vah nə qəm,
Kim sarı görkəzdi gül, ol tazə şaxi-ərğüvan.

Çün bahar eyşim olmuş qəm xəzanına bədəl,
Eylərəm işrəti-sərvdən növheyi-möhnət güman.

Firqətindən cavidan matəmə düşdüm aqibət,
Ey vüsalın xəstə canıma həyati-cavidan.

Çün həyat əhli vəfadan yaxşı ərməs hicr ara,
Səndən ayrı nədən olmam mən qatı qanlı yaman.

Saqiya, gülgün qədəh tut kim, əcəb güllər açar,
Dəhr bostanında əhvalıma dövri-asiman.

Dastani-dərd oxur ərdi Hüseyni eşq ara,
İndi eşqü dərdindən xalq içrədir yüz dastan.

### ☙ 141 ❧

Ah, əgər görsəm yenə ol mahi-tabanımı mən,
Verərəm şükraneyi-vəsli üçün canımı mən.

Ey müsəlmanlar, quyun kim sərf qıldım yolunda,
Zülfündən zünnar bağlar dinü imanımı mən.

Eşiyində gecələr çox ağlamaqdan aqibət,
Aşikarə eylədim bu sirri-pünhanımı mən.

Dedi axır: var muradım kim, səni öldürəm mən,
Gər sənin rəyin budur, qıldım bəxil qanımı mən.

Necə dersən kim, Hüseyni, qalmadı canın sənin,
Ey nəsihətgu, nedim, bu yarsız canımı mən?

### 142

Heç müsəlmana, nigara, daği-hicran olmasın,
Kim vüsalından cüda olsa, ona can olmasın.

Göz ucundan navəki-cəbrin bilə öldür məni,
Daməni-pakın, bəyim, nagah yenə qan olmasın.

Xəstə könlüm bəndi-zülfündən pərişandır bəsi,
Cəm qılgil sünbülünü kim, pərişan olmasın.

Cana yetdim dilbəri-nadan əlindən, ah-ah,
Heç kişinin dünyada məhbubu nadan olmasın.

Can verəndə gəlib otur bir dəmi, görək səni –
Kim, Hüseyni könlündə, ey dost, ərman olmasın.

## ~ 143 ~

Ey səba, vergil xəbər, sərvi-rəvanım gəldimi?
Can iyi səndən gələr, ruhi-rəvanım gəldimi?

Hicr dəştində yorulub qalmış ərdi xəstə can,
Vah, deyin kim, ol qəribi-natəvanım gəldimi?

Gələn ərmiş xublar eşq əhli qanın tökəli,
Ey könül, gör kim, mənim qətlimə canım gəldimi?

Zülfündə sən bəndü mən, köyündə bimar, ey könül,
Zə'findən de kim, sana munluğ fəğanım gəldimi?

Yar mehman olsa cismim öyünə, can eylər nisar,
Deyiniz, ey dostlar kim, mehmanım gəldimi?

Mən xud öldüm hicrində, ol səktə deb qılmış güman,
Vah, deyin kim, başıma ol bədgümanım gəldimi?

Rəhm edib bir gün Hüseynini itindən sorasan,
Ol məlamət köyündə itən yamanım gəldimi?

## 144

Ey cəfa tiği, gəlib məcruh köksümü yaru,
Qol yalan eyləb salıb, hər yan içimi axtaru.

Axtaranda tapsan ol könlüm ki, Məcnun şivədir,
Hər necə olsa adəm səhrası sarı göndəru.

Göndərəndə varmasa könlüm adəm səhrasına,
Döş-döşündən sancıban ol sarı onu qaytaru.

Qaytaranda vaqif ol kim, yenə qaydıb gəlməsin,
Tanrı üçün, natəvan canımı ondan qurtaru.

Qurtaranda natəvan canımı ol bibakdən,
Yüz cəfa eyləb onu gətir, qaşımdan ötgərü.

İstəyib gəlsə yenə köksüm şəqafın tapmağa,
Vah ki, bir mərhəm qoyub ol çaki-köksüm bitgərü.

Eyləsən miskin Hüseyni canını ondan xilas,
Virdi bu olar duada sən dəxi daim yaru.

### ☙ 145 ❧

Bir quyaş hicrində çəkdim odlu əfğan bu gecə,
Köyməyim dudindən oldu, çərx giryan bu gecə.

Ol quyaş hicranında hər bir qarası şəklindən
Qoydular hər bir gözüm bir daği-xirmən bu gecə.

Şami-hicranımı bilməm kim, bu yanlığ tirədir,
Ya qılıbdır dudi-ahım ayı pünhan bu gecə.

Tökdü kövkəb firqətin şamında gözüm onca kim,
Qaldı gərdun yüz tümən göz birlə heyran bu gecə.

Ey əcəl, dadıma yetgil, bu qatı halətdə kim,
Yox dürur fayda mənim şamıma payan, bu gecə.

Pərçəmin dan yelindən aşüftə olmuş, guya ki,
Kim qılıbdır ruzigarımı pərişan bu gecə.

Ey Hüseyni, yarın köksümə dikən navəkin,
Can verib, qıldım pozuq könlümə mehman bu gecə.

**146**

Vah ki, hicran tərxin ol ay saldı bünyad özgəcə,
Natəvan könlümə bünyad etdi bidad özgəcə.

Qəm dağın dırnaq bilə qazdım demə Fərhad, kim
Mən ərər mən özgəcə, eşq içrə Fərhad özgəcə.

Yox əsər könlünə yü, polad ahımdan ərər,
Özgəcədir bu qatılıq içrə polad özgəcə.

Adəmilik rəsmin ər bilməz ərər mə'zur kim,
Adəmizad özgəcə ərmiş, pərizad özgəcə.

Könlümə bağü baharü badədən yetməz nəşat,
Kim olubdur hicrdən bu qatla naşad özgəcə.

Bu çəmən rə'naların çox söymə kim, eylər sitəm
Gül bilə sərv özgəcə, nəsrinü şəmşad özgəcə.

Ey Hüseyni, yar çün cəbr etdi adət özgə növ',
Sən dəxi olgil cəfakeşlikdə mötad özgəcə.

## 147

Qəm yeli eyşim binasın qıldı viran özgəcə,
Səbrü huşum kişvərin yer birlə yeksan özgəcə.

Bir ləbi-lə'li ki, şövqündən yaşım xunab idi,
İndi könlüm oldu onun hicrindən qan özgəcə.

İstəyən könlümü tapsın bir tutuşan şö'lə kim,
Örtədi bu qatla onu daği-hicran özgəcə.

Özgəcə zülm eylədi çün canıma çərx, ey rəfiq,
Eyb iməs mən dəxi çəksəm ahü əfğan özgəcə.

Özgəcə möhnət üzümə gəldi hicran dərdindən,
Nə əcəb axsa üzümdə əşki-qəltan özgəcə.

İçməyə ərdim tənəüm dövründə cami-visal,
Bilsəm ərdi hicrindən olar bu dövran özgəcə.

Səbr qılmaqdan dəva yetməz Hüseyni dərdinə,
Ey xirəd, tapgil onun dərdinə dərman özgəcə.

## ☙ 148 ❧

Ah kim, oldum yenə eşq içrə şeyda özgəcə,
Əqli-huşumdan cüda, xalq içrə rüsva, özgəcə.

Vəhm edər ərdim bəlayi-hicrindən yüz vay kim,
Canıma dürlü bəlalar oldu peyda özgəcə.

Huşü əqlim tapdılar tarac kim, eşqi-fəraq
Saldı könlüm kişvərü mülkünə yağma özgəcə.

Olsa halım özgəcə, eyb etməyin, ey dostlar,
Kim düşübdür dilbərim başına sevda özgəcə.

Yar olsa özgəcə, vah, ixtiyarı var dürur,
Olmağımdır mən vəfa babında vəfa özgəcə.

Bu çəmən rə’nalarının cilvəsi bir növ’ iməs,
Həm gül eylər özgəcə, həm sərvi-rə’na özgəcə.

Ey Hüseyni, afiyət köyündə məskən tapmağın,
Özün bu aşüftəlikdən qılmağın ta özgəcə.

**149**

Olalı lə’li üzə xətti nəmudar özgəcə,
Tutdu ahım bərqindən göy üzü zəngar özgəcə.

Ta ki qıldım ol büti-meyxarə alnında sücud,
Saldı zülfi-tarından boynuma zünnar özgəcə.

Yaşırın mey içməmiş olsan, niyə olmuş bu növ’,
Ləbdə güftar özgəcə, baş üzrə dəstar özgəcə.

Qorxuzub sən hicrdən, öldür, dəxi yandır, vəleyk
Ey sitəmkar, istəmə könlümə azar özgəcə.

Nə sorarsan zari-könlüm zə’fini, başına yet –
Kim, bu gündən olmuş ol məcruh, bimar özgəcə.

Kimi kim, dövran elindən yar tutdum, aqibət
Özgəcə çıxdı, özün gər qıldı izhar özgəcə.

Ey Hüseyni, xəttindən rüxsarı olmuş özgə növ’,
Səbzədən andağ ki, olar baği-gülzar özgəcə.

**150**

Rənc ilə köydü könül, deməz onu cananına,
Harda bülbül köysə qəm olar gül xəndanına.

Yüz qəmü dərd içrə qaldı hicr ara, vah, xəstə can,
Bir qədəm basarmı deb bu külbeyi-əhzanına.

Bir mənim tək zari-qəmgin olmaya, vah, eşq ara
Yaşı axan gözündənü, vah, könlü köyən canına.

Kirpiyin iki sipah, hər dəm düzüb bərhəm urar,
Yüz firib eylər bu könlüm qarəti-imanına.

Mərdümi çeşmim ərib axdı cəmalın şövqündən,
Rəhm edən çağdır Hüseyni dideyi-giryanına.

**151**

Cilvə qıldı bağ ara ol sərvi-azadım yenə,
Yandırar eşq əhlini bu ahü fəryadım yenə.

Tilbə könlüm şurişi bülbülü lal etmiş bu gün,
Qıldı gülşəndən güzər guya pərizadım yenə.

Necə bidad eyləyim könlümə, vah, ol xəstəyə,
Əsrü həddən aşdı bidad üzrə bidadım yenə.

Cəbr bünyad eyləmiş, vah kim, peyapey ahdan,
Olan təkdir dəmbədəm bərbad bünyadım yenə.

Görgəc ol ayı çəkər dedim Hüseyni tək fəğan,
Müddəilər tənindən özümü əsrədim yenə.

### ☙ 152 ❧

Hicri-şamı ay çıxıb, mən ağlar ərdim dərd ilə,
Seyrlər qıldım səni istəb mahi-şəbgərd ilə.

Ay oyanğac yenə könlümü pozub yalnızlığım,
Tirə şamım ənduhundan ağladım köp dərd ilə.

Çərx həm əncüm sirişkin halıma çox saçdı, leyk
Olmadı ağlarda dəng mən zari-qəmpərvərd ilə.

Matəmimə çərxi-göy eylər libasın tün qara,
Sübh həm eylər yaxasın çak, ahi-sərd ilə.

Şami-hicrandan qurtulunca isitdim mehr tək,
Əşki-seylin axızıb, titrər izari-zərd ilə.

Dəhr bostanına çox qoyma könül, ey əndəlib,
Kim, ona buyi-vəfa yox yüz tümən min vərd ilə.

Ey Hüseyni, uyğu, bixudluq yemək qəmdir mana,
Ta nə olar aqibət halım bu xabi-xürd ilə.

## 153

Hanı göz kim, səni görəm mən dəmi-əğyar ilə,
Ya ki görəm mən yenə əğyar ilə güftar ilə.

Mana vardır öz gözümdən rəşk, vah, nedib görəm,
Arizin vəslin yenə bir dideyi-əğyar ilə.

Öz qulağımdan ününü çün duyaram, vah, nə eyb,
Olsam el birlə, desən söz lə'li-şəkkərbar ilə.

Desə olmaz eşq ətvarında onu yar kim,
Qeyrinin vəslin təsəvvür eylə başqa yar ilə.

Hər pərindən bir tikan bülbülə sancılsa, nə eyb,
Çün görər bağ içrə güldən həmnişinlik xar ilə.

Mən daim azardayam səndən, gər öldürsən vəleyk,
Rəşkdəndir gah-gahi olmağım azar ilə.

Ey Hüseyni, yar çün göz mərdümidir, gözün yum,
Göz öyü tək yer gərək xəlvət üçün dildar ilə.

### 154

Necə ol ay hicrində könlüm pozular qəm bilə,
Necə cismim öyü yumrular qəmü matəm bilə.

Necə olar hicri-şamı, zülfi-tabı yadından,
Tari-cismim gecə dan atınca piçü xəm bilə.

Necə hər dəm ol Məsihənfas gülrux hicrində,
Yandıraram cümleyi-aləmi odlu dəm bilə.

Necə viranımıyü həmsayələrin həm öyün,
Hicrindən giryan gözüm xunabı pozar nəm bilə.

Necə ol bədmehr zülfü tək pərişan qılaram,
Aləm əhli könlünü bu xatiri-bərhəm bilə.

Çərx kəci birlə çöhrəm gərçi oldu nilgün,
Nə qıla, alan kişi bu nilgünü tarım bilə.

Ey Hüseyni, hicrindən canım qurtulsa, əhd edəm
Ki, aşnalıq qılmayım cinsi-bəni-adəm bilə.

## 155

Könlüm alar qönçeyi-sirabı güftarı bilə,
Canım yaxar atəşin lə'li-şəkərbarı bilə.

Dəhr bazarında qovğa saldı Yusif hüsnü kim,
Cilvəgər oldu sənin hüsnün nəmudarı bilə.

Tiği-zəxmindən ərər xürsənd könlüm, ey rəfiq,
Yaxsa mərhəm, qoy ölək ol zəxmi-azarı bilə.

Məhv mən andağ ol ay hüsnünə kim, yoxdur işim,
Eşqinin əhfasiyü dərdimin izharı bilə.

Yalnız ol ay hicrində sərgəştə ərməzəm ki, var
Çərx həm bu işə bais, dövr pərgarı bilə.

Ey ki, dersən: tapmadım mətlubu çox istəyib,
Bil ki, ol istəkdə həmradır tələbkarı bilə.

İtlərinə tö'mə olar deb Hüseyni qoydu üz,
Ol sənəm köyünə üryan cismü əfgarı bilə.

## 156

Hər haçan kim, gəlsə ol sərv pərirux yadıma,
Gəlməz ol dəm huri-cənnət xatiri-naşadıma.

Gər yetişməz sana fəryadi-fəğanım zə'fdən,
Ey fəğanım, barçasından sən yetiş fəryadıma.

Qəddü üzün hicrindən bağ içrə girsəm, bağban
Der ki: vah, od salma ahından güli-şəmşadıma.

Kuhi-dərdimdən səba ərz etsə şirin qissələr,
Necə desən bir pəyamı yetir ol Fərhadıma.

Sərvindən azadi-fariqdir Hüseyni huridən,
Ey səba, mundağ deyərsən sərvi-hurizadıma.

### ☙ 157 ❧

Şami-hicrini görgəc gəldi zülfün yadıma,
Düşdü sübhi-vəsl ümidi xatiri-naşadıma.

Məst ikəndə, deməgil, sundum ayaq kim, öpəsən,
İndi sungil, əsrük ərdim onda, gəlməz yadıma.

Məqdəmindən üz xərab, abad ərər, ey gənci-hüsn,
Vah, nə olar bir yetişsən bu xərab abadıma.

Harda cənnət sərvi birlə huriyə qoyar könül,
Gər mələk nəzzarə qılsa sərvi-hurizadıma.

Zikridir ağzımda sübhü şam, zahid, demə söz,
Sudu yox, pəndin bilə salma fütur övradıma.

Ağıl qeydindən xilas olar idi Məcnun əgər,
Eşqi-torunda qulaq assa idi irşadıma.

Ey Hüseyni, hicri-zülmündən necə fəryad edək,
Bu qatı halətdə çün, yetməs kişi fəryadıma.

## 158

Arizin mehrin açıb, cismim ara can örtəmə!
Aşikarə lütf edib, könlümü pünhan örtəmə!

Bərqi-hicran nal tək cismimdə bəsdir, sən dəxi
Vədeyi-vəsl eyləyib, ey əhdi yalan, örtəmə!

Kuhi-qəm oldu tənim ətfal daşından yana,
Lalə tək könlümü sən, ey odlu əfğan, örtəmə!

Lə'li-canbəxşən, üzə sən xali-hicran qoymagil,
Canım üzrə hər zaman bir daği-xirmən örtəmə!

Atəşin könlümdə xoşdur, navəkinin kəsrəti,
Bərqi-hicranın salıb könlümdə peykan, örtəmə!

Sübhi-vəslindən məni ol yar naümud eylədi,
Sən qara bəxtim kimi, ey şami-hicran, örtəmə!

Ey Hüseyni, çəkmə onsuz ah, xubları görüb –
Bir vəfasız odundan, yüz namüsəlman, örtəmə!

## ☙ 159 ❧

Ey göz, özgə üz sarı özünü heyran istəmə,
Bir vəfasız eşqindən könlünü həm qan istəmə.

Eylədim könlüm öyün abad bikəslik bilə,
Çəkmişəm zəhmət bəsi, bu öyü viran istəmə.

Çünki tərki-mehrin etdim, cəbrini həm istəməm,
Ey könül, sən həm yenə olma peşiman, istəmə.

Vardı ol namehriban mehri könüldən bəd əz in,
Nalə məndən tutmagil göz, özgə əfğan istəmə.

Atəşin könlüm odu birlə tutuşmuş oxları,
Ey sözə gələn könül, halını peykan istəmə.

Ey Hüseyni, qılmadın çün afyiət küncün vətən,
Vah, nə dərdli canına sən indi dərman istəmə.

**❧ 160 ☙**

Çareyi-eşqi nədir, cüz səbr məhzun könlümə,
Çün qeylə almaz qeylin, bir çarə Məcnun könlümə.

Qoydu ol ay eşqində üz, yanağı qanlı tazə dağ,
Vah, nə güllər açdı ol rüxsari-gülgün könlümə.

Ta ki odlu arizi-şövqü könlümü örtədi,
Hər necə baxsam soyuqdur mehri gərdun könlümə.

Nə həkimü, nə füsungərdən cünunum dəf olar,
Kim nə hikmət nəf yetirdi, nə əfsun könlümə.

Sərvi sarı nə könül birlə baxaq, ey bağban,
Mən ki, hər dəm övrülər ol qəddi-mövzun könlümə.

Olmasa rövşən gözüm hər dəm səvad xəttindən,
Tirədir, billah, sərasər dünyayi-dun könlümə.

Ey Hüseyni, demə tərkin tut ki, çoxdur əhli-hüsn,
Var isə yaxmaz, nedək, onsuz biri çün könlümə.

### 161

Ey könül, dərdimi ərz et ol mahi-tənnazıma,
Xəstə canımın həlakın de sərvi-nazıma.

Sorsa səndən ölənim keyfiyyətini, sərbəsər
Şərhini mundağ deyəsən ol mahi-tənnazıma:

«Qan olub bağrı, köyüb cismi, gözü qan-yaş töküb,
Bu üqubətlər bilə öldü» degil həmrazıma.

Çünki öldüm hicrində bir şəmmeyi-ayt, ey rəfiq,
Olsun ol vaqif nə oldu uşbu məxfirazıma.

Hicr ara dəm urmayın, canım fəda qıldım degil,
Çün eşitməz, gər eşitsə, gülruxi-qammazıma.

Mən xud öldüm, ey könül, sən növhə çəkib nalə qıl,
Ola ki, rəhm eyləyib sala qulaq bu sazıma.

Ey Hüseyni, yar üçün canını qılmışsan fəda,
Can fəda qılmaq ərər aşiq kişiyə lazıma.

## 162

Uzr üçün şirin hədisini şəkərriz eyləmə,
Bu füsun birlə odumu dəmbədəm tiz eyləmə.

Ərğüvani arizin məhbubluqdan yaşırıb,
Zə’fərani üz bilə əşkimi gülriz eyləmə.

Deməgil şirin zəbanlıq birlə üz odlu hədis,
Dudi-ahımı ol oddan atəşəngiz eyləmə.

Şuxluqdan hər zamanı bir bəhanə qılmagil,
Natəvan könlümü hər dəm qüssəamiz eyləmə.

Xublarda səndən özgə çünki məhbub istəməs,
Gəl Hüseyni sarı indi, bunca pəhriz eyləmə.

## ☙ 163 ❧

Xəttinin tarı düşübdür lə'li-meygün üstünə,
Öylə kim, can riştəsi bir qətreyi-xun üstünə.

Dişləri üstündə hər kim lə'li görgəc dedi:
Bərgi-güldür kim, düşübdür dürri-məknun üstünə.

Xalının hər dəm xəyalı tilbə könlümdə ərər,
Zağlar ondağ ki, qovğa qıldı Məcnun üstünə.

Deyər: sərv üzrə gül peyvənd qılmış bağban,
Kim ki, görsə arizin ol qəddi-mövzun üstünə.

Yeni ay onun səməndi-nalından gəldi nişan,
Ol quyaş rəxşin məgər səyritdi gərdun üstünə.

Meyə xərəkmi rəhnü mən məxmur nedək mey füruş,
Yenə bir peymanə həm versən bu mərhun üstünə.

Seyli-əşk içrə Hüseyni çün görünməz, istəmə –
Kim, görünər düşsə bir xəşək Ceyhun üstünə.

## 164

Xətti-canəfza çıxarmış, lə’li-xəndan üstünə,
Xıdır tək kim sayə salar abi-heyvan üstünə.

Öylədir kim, zəxm üzə hər yan çibin qıla hücüm,
Zağlar qonsa bu qanlı cismi-üryan üstünə.

Göz yaşım seylindən olmaz zə’flik cismim əyan,
Harda bir xas zahir ola bəhri-ümman üstünə.

Külbəm içrə örtənərəm, düşə əlimə köyüb,
Hansı bir quş kim, dəmi qonsa bu viran üstünə.

Başın üzrə gülmü sancıbdır, sən ey rə’na nihal,
Yoxsa pənvənd eylədin sərvi-xuraman üstünə.

Hicr odu bidadından, bilgil kim, ahım dudidir,
Hər bulud, kim sayə sala əhli-dövran üstünə.

İtlərinə gər fəda oldu sünək tək peykərim,
Ey Hüseyni, heyrət etmə, suz varar can üstünə.

## 165

Dərdmənd eşqinin könlü açılmaz bağ üzə,
Əhli-qəm canına naseh pəndi oddur yağ üzə.

Qamətin nəqşini köyən könlüm içrə əsrədim,
Ey gözi-eyni bəla, kəsdim əlif bu dağ üzə.

Sayə sarı çəbükəm qalpaği-rövşənrək durar,
Necə kim, pərtöv salar rövşəni-quyaş qalpaq üzə.

Köyi-toprağında zə'fimdən nişan peyda iməs,
Leyk qüvvət yox gecə girməyə ol topraq üzə.

Təndə yox dırnaqca yer, kim daği-eşqin onda yox,
Həmə nüqündən əsər qalan kimi dırnaq üzə.

Kim ki, xalını görər, mən tilbənin halın bilər,
Anlayar Məcnun qəmin hər kim, ki baxsa zağ üzə.

Gər Hüseyni könlü səydin ovlamaz ol bağrı daş,
Bu məsəldir, kim geyik olmaz üşəngən dağ üzə.

## ☙ 166 ❧

Ey könül, gərdun bəliyyət daşını yağdırdı-la,
Hər tərəf səbrim öyi divarını sındırdı-la.

Qılmadı həm tərk, çün divarına verdi şikəst,
Seyli-qəm səqfin qara toprağa həm endirdi-lə.

Eylər ərdim eşqin rüsvalarına sərzəniş,
Olalı rüsva, sözüm laf ikəni bildirdi-lə.

Yetsə hər qəm elmü aqıl övraqı ərdi munisim,
Hər varanı bir sarı ahım yeli sovdurdu-la.

Mizraqi-zöhd içrə kim, cəm ərdi səbrim xirməni,
Səyrib ol xirmənə bir bərqi-bəla köydürdü-lə!

Afyiət küncündə daim başım ərdi səcdədə,
Eşq axır bunca şiddət başıma gətirdi-lə!

Ey Hüseyni, el eşitməz ərdi təsbihim ünün,
Eşq əfğanımı gərdun tağından aşırdı-la!

## ❧ 167 ❧

Vay, yüz min vay kim, sərvi-rəvanım vardı-la!
Səbrü huşum mülkündən arami-canım vardı-la!

Rişteyi-canım bilə vəsli onun peyvənd idi,
Cavidan firqət gəlib, peyvəndi-canım vardı-la!

Kim bilə əngiz mehr edim mən indi, ey könül,
Çünki mehrəngiz adlı mehribanım vardı-la!

Sorma canım halından, dəxi cahan iqbalından,
Ey rəfiqi-mehriban, canü cahanım vardı-la!

Natəvan olsam qərib ərməs onun hicranından,
Nə üçün kim, ol qəribi-natəvanım vardı-la!

Gərçi istər, tapmadım, leykin gözümdən varalı,
Onu istər, üz sarı əşki-rəvanım vardı-la!

Ey Hüseyni, hicrində tapsam həlaki-cavidan,
Qılmagil heyrət, həyati-cavidanım vardı-la!

## ☙ 168 ❧

Ey sana Məcnun sifət hər köşeyi-divanə, ya,
Arizinin mehrinə şəm'i-fələk pərvanə, ya.

Möhnəti-Yəqub ərər dərdimdən, ey can, şəmmə, ya,
Oldu Yusif qissəsi dövründə bir əfsanə, ya.

Canü könlüm oldu viran eşq odu birlə, nə qəm,
Çün mana oldu bəla köyündə möhnətxanə, ya.

Aşiqi-biçarəyə çün vəsl ümidi yox dürur,
İndidən sonra fəraqi-köşeyi-viranə, ya.

Yar ürəyimi, çıxar bu bivəfa canı rəvan,
Nə dilər axır öyündə can mən biganə, ya.

Ey Hüseyni, cür'eyi-vəsli meyindən içməyin,
Ey, xud öldün, vay gər kim, versələr peymanə, ya.

## ☙ 169 ❧

Nöqteyi-xalın əcəb, yox lə'li-xəndan üstünə –
Kim, olar bir qətrə daim abi-heyvan üstünə.

Hicrin oxu ta tikilmiş könlümə, ey qaşı yay,
Lə'lgün əşkimə oxşar xari-müjgan üstünə.

Navəkinə bax ki, daği-həsrətimdəndir nişan,
Cövhəri kim, görünər polad peykan üstünə.

Ey səba, qanlı gözümə köyündən yetir qubar,
Rəsm ərər topraq dökmək daima qan üstünə.

Eşq tiğindən pozuq könlümdə ərdi çaklar,
Vah ki, oldu bir səri bu daği-hicran üstünə.

Lə'li-sirabın qəmindən natəvan cismim ərər,
Misli-xəşəki ki, düşə abi-heyvan üstünə.

Ey Hüseyni, yar gəlsə nəqdi-can eylə nisar,
El saçıq saçan kimi dilxahi-mehman üstünə.

### ☙ 170 ❧

Səbzeyi-xəttin səvadı lə’li-xəndan üstünə,
Xıdır guya sayə salmış abi-heyvan üstünə.

Ol yaşıl donlu başı üzrə qüreyşi börküdür,
Öylə kim, düşə qırov sərvi-xuraman üstünə.

Ta ki sancıldı pozulan könlüm içrə navəkin,
Öylə quşdur kim, nəşimən qıldı viran üstünə.

Mən pərişan halın könlünə saldı yüz gireh,
Hər gireh kim düşdü ol zülfi-pərişan üstünə.

Buləcəb ərməs məlahətli ləbin üstündə xal,
Kim çibin gahi olar sakin nəməkdan üstünə.

Özün xoş tutgil ki, axır tirə xak altındadır,
Ol ki, hələ Rəxş sürər çərxi-gərdan üstünə.

Ey Hüseyni, bivəfalara könlünü verməgil,
Çün vəfalı yar tapdın, söz demə can üstünə.

## 171

Ol zümərrəd xətt ki, çıxmış lə’li-xəndan üstünə,
Səbzeyi kim, əsibdir abi-heyvan üstünə.

Örpəyin alğac qəddi-rüxsarından, qaldım əcəb,
Gül açılmaq türfədir sərvi-xuraman üstünə.

Zə’fim ondağdır ki, bir-birdən tökülər peykərim,
Qonsa quş nagah məni-Məcnunü üryan üstünə.

Hicr odundan bir şərər aləmi yaxar, ey rəfiq,
Mərhəmin nə nəf qıla daği-hicran üstünə.

Şək iməs kim, seyrdən qala, təhərrük etməyə,
Qoysalar kuhi-qəmimi çərxi-gərdan üstünə.

Çərx zülmündən pozuq cismim ərər ər birlə dəng,
Vah, bəla daşı necə yağar bu viran üstünə.

Çün Hüseyni yüz ayaq xunab gözündən dökər,
Sən dəxi yetirgil ayaq bu çeşmi-giryan üstünə.

**172**

Vah ki, bir gül şövqündən halım pərişandır, nedək,
Suzi-can içrə könüldə dərdi pünhandır, nedək.

Ey müsəlmanlar, əgər mən kafiri-eşq olmuşam,
Qəsdi-dinim qılğıcı bir namüsəlmandır, nedək.

Demə: ey həmdəm, könlünü hali et bir ah ilə,
Dəm urana yox mahal, könlüm dolu qandır, nedək.

Ol pəri vəslin dedim, istə cünun səhrasında,
Tilbə könlüm mübtəlayi-bəndi-hicrandır, nedək.

Zülfü tovlandı dedin, sən hörməgil çox piçü tab,
Hər səri muyuma bağlı zülfi-piçandır, nedək.

Tirə qıldı zülfi-eyşim sübhünü çün şami-qəm,
Özgələrin bəzmində ol şəm’i-rəxşandır, nedək.

Ey Hüseyni, afiyət küncündə gər tutman qərar,
Kə’beyi-vəsli həzin könlümə ərmandır, nedək.

**173**

Yar zülm edəndə çün biixtiyar olmuş, nedək?
Vah, ona cəbrü sitəm qılmaq şüar olmuş, nedək?

Natəvan könlüm, gözü yanlığ idi bimarü məst,
Zülfü tək indi pərişan ruzigar olmuş, nedək?

Ey ki, dersiz: ol pəri eşqin nihan tutgil, bu kim
Ahü dərdim hicrindən biixtiyar olmuş, nedək?

Deməyin kim, sirri-eşqini yaşırgil el ara,
Mən yaşırmazdan burunraq aşikar olmuş, nedək?

Deməyin: könlümə məhvəşlər sarı verme qərar,
Vah ki, bir məhvəşə zarü biqərar olmuş, nedək?

Könlümə çün derəm: ol güldən xilas et özün, der:
Xari-eşqi çün içimdə üstüvar olmuş, nedək?

Gər Hüseyni tək nəva çəkər desəm üşşaq ara,
Qismətim ol naleyü əfğanü zar olmuş, nedək?

**❧ 174 ☙**

Necə ahım dudi tək köyündə heryan aylanam,
Gərd tək kim, tutsa yel, ol yerdə həm bir dəm dinəm.

Tiri-barani-qəmin ol növ' yağdı cismimə,
Saxla, almazam hesabın, gər onu yüz yıl sanam.

Ey əcəl, bu zə'fdən mən xud dirilgim yox dürur,
Can verəndə qoy ki, onun asitanın yastanam.

Hicrinə örgənmək imkan yox ki, ol mühlik dürur,
Bəs əcəbdir, kimsə ölməyə, demək kim, örgənəm.

Mən mənü eşq, ey könül, ərmə həvayi-şəmməyi,
Zatıma gər zöhd ayinini illər ötgənəm.

Köyündə bixud yıxıldım, tapmaym, ya rəb, murad,
Gər desəm kim, bu farağat uyğusundan oyanam.

Ey Hüseyni, yaşırın şəm'i-şəbistanım mənim,
Eşqindən  mən hər gecə pərvanə yanlığ örtənəm.

**175**

Yetdi can ağzıma, yetir ləbi kim can tapşıra,
Varı ölməzdən qabaq bu nəqdi-pünhan tapşıra.

Demə: hüsn əhlinə neçün nəqd can tapşırmadın,
İndi kim tapdım sənin tək namüsəlman, tapşıra.

Hicr ara düşvar can verməkdən olmuşam mə’lul,
Başıma, ey ömr, batraq gəl ki, asan tapşıra.

Vəsl ümidi birlə gər tapşırmadım canımı, leyk
İndi kim canıma mühlik oldu hicran, tapşıra.

Qan dökənə istədin könlüm, gər ol avaranı
Tapmadım, gəl kim, əvəz canımı tavan tapşıra.

Tiri-barani-qəmin öldürsə, mən həm yadigar
Navəki-cəbrin üçün bir niçə peykan tapşıra.

Ey Hüseyni, canı canan alnında tapşır dedin,
Olsa yüz canım qəbul, gər qılsa canan, tapşıra.

**176**

Eşq ara Məcnunu derəm kim, özümə oxşadam,
Huşunu zail qılıb, divanəliyi örgədəm.

Sübhi-vəslü şami-hicran tək neçə aləm elin,
Bu əcəb halıma gahi güldürəm, gah ağladam.

Can verərəm hicrində, zə'fimdən el görməz məni,
Eşq ara hər neçə derəm kim, özümü görsədəm.

Üns tutmuşam geyiklər birlə kim, ol şahsüvar
Ava gələndə ona bu növ' özümü uçradam.

Çün göz açmaz uyğudan bəxtim, nə sud, ey dostlar,
Gər fəğandan hər gecə aləm elini oyadam.

Köksümə daş urmağımı eyb qılma, ey rəfiq,
Qoy ki, onda oynayan peykanlarını ornadam.

Çün Hüseyni könlü hər dəm bir tərəf avaradır,
Söz desən dur kim, cəvabında könlünü toxtadam.

## ❧ 177 ☙

Necə hicran sağərindən dəmbədəm özdən varam,
Vəsl canın gər tutar olsan, ləbaləb sıbqaram.

Eşqdən canıma yetdim, saqiya, tut sağəri,
Ta zamanı ağıl nənindən özümü qurtaram.

Çərx əgər üşşaq dərdi nəqdindən qılsa təmə,
Mən həm ol ay hicrində ahım xədəngin ötürəm.

Vədə qətlimə əgər qılsan ki, qılasan şəhid,
Başıma gəlsə əcəl, canım varınca yalvaram.

Sərvi-gül ruyimi bir dəm görməsəm, ey bağban,
Dəhr gülzarını derəm kim, səba tək axtaram.

Qafil olğac ol pəri köyündə varar baş alıb,
Əql öyünə tilbə könlümü necə kim, başqaram.

Ey Hüseyni, çərx zülmi birlə olsa, mən dəxi
Əşk tufanı bilə gərdun binasın döndərəm.

## ❧ 178 ☙

Müşkbuy xəttinmi, de, ya lə'li-dürbarınmı, de,
Üzü imanınmı, de, ya zülfi-zünnarınmı, de.

Kövsəri-lə'linmi söylə, yoxsa xəttindən onun
Dövrəsində səbzeyi-cənnət nəmudarınmı, de.

Səbzeyü gül tək xətti birlə üzünmü şərh edək,
Səbzeyü güldən bəzənən bağı-rüxsarınmı, de.

Rişteyi-can birlə heyvan soyundan sordun xəbər,
Belinin tarınmı deyim, lə'li-güftarınmı, de.

Ey ki, dersən: eşqində vəsf eylə könlün halını,
Hər tərəf zəxminmi, de, ya naleyi-zarınmı, de.

Dəhr bağı güllərində gərçi yox buyi-vəfa,
Hər birinin dövrəsində yüz cəfa xarınmı, de.

Ey Hüseyni, deməgil kim, yar eşqin şərh edək,
Vəslinin rəşkinmi, de, hicrinin azarınmı, de.

**179**

Hüsn ilə sən kamilü Şirinü Leyli şöhrəti,
Eşq ara mən zar olub Fərhadü Məcnun töhməti.

Afiyət çağın farağat saqınar ərdi könül,
Eşq ara bildirdi, vah-vah, ol farağat möhnəti.

Eşq tiğindən tənimdə yüz tümən nalü əlif,
Bir gəda yanlığ ki, döş-döşdən kəsilmiş qəsvəti.

Ah odu yaxar tənim, eşqində piçü tab ilə,
Ol səbəbdən oldu guya bərq yanlığ hey’əti.

Eşqində canımı al, cismimi yandır, ey əcəl,
Yelə sovurgil ki, eşq əhlinin olsun ibrəti.

Vaiza, gər xubların eşqi günah ərər, nə qəm,
Çünki tanrının günah əhlinə çoxdur rəhməti.

Ey Hüseyni, der idim: eşqimi pünhan saxlayım,
Bilmədim kim, eyləmiş göz yaşı aləm şöhrəti.

### ❧ 180 ☙

Bəs iməs ərdi mana həm öz odum, həm yar odu,
Kim ona əfzun dəxi olmuş yenə bir zar odu.

Öz odum könlümə afət, yar odu cana bəla,
Baisi-ənduhü dərd ol, bidili-bimar odu.

Bu bəla bərqi, ol afəti-duzəxi gör türfə kim,
Tiz edər bu ikini bir xatiri-əfgar odu.

Böylə üç od bir könülə düşsə, köymək neyləyər,
Öylə kim, bülbül oduyü, gül oduyü, xar odu.

Cani-könlüm birlə bağrım köydü bu üç od bilə,
Yaxşı baxsam, yüz tamuğca hər birinin var odu.

Öz odum, ya yar oduna gərçi təskin versə əşk,
Vah, onu neylim ki, qılar yüz çakin izhar odu.

Gər Hüseyniyə bir odlu üz qəmi od salmasa,
Bəs niçin aləmi yandırdı Nəvaivar odu.

## ❧ 181 ❧

Eşqin odu cismi-canı, natəvanım örtədi,
Türfə od ərdi ki, peydayü nihanım örtədi.

Ruzigarım eylədi xalın səvadı tək qara,
Ruzigarım xud nə ola, xanimanım örtədi.

Xanimanım örtədi zülfün tünü tək, ey quyaş,
Xanimanı kim, varı namü nişanım örtədi.

Sorsalar əhbabi-könlüm, yanmağın de, ey səba,
Kim, onu bir xürdə mahi, xürdadanım örtədi.

Odlu əhvalımı görən xalq köydü sərbəsər,
Görməyəni həm eşitgəc dastanım örtədi.

Necə kim, vəsli-nihalın can ara əkdi könül,
Hicr odu birlə onu sərvi-rəvanım örtədi.

Yeddi göy kim, zahir eylər cismdə kül rəngini,
Ey Hüseyni, barçasın odlu fəğanım örtədi.

**182**

Bir pərivəş şövqü odu cismü canım örtədi,
Ayrılıb bir uçqun ondan, xanimanım örtədi.

Mən cahanü can fədası qılmış ərdim ey könül,
Üzünə gəlməm əgər canü cahanım örtədi.

Kuhi-ahən olsa, eşqi odu yaxar, ey könül,
Eyb yox, ol od gərçi cismi-natəvanım örtədi.

Könlüm ondan özgəyə mümkin iməs meyl eyləmək,
Vah ki, töhmət birlə şuxi-bədgümanım, örtədi.

Könlüm istər çağda çox ümid verdi mehrindən,
Vah ki, sonra zalimi-namehribanım örtədi.

Zülfündə sərgəştə səbrim heyli sarı açdı üz,
Bərq urub, axşam uzaşan karivanım örtədi.

Bu ki, tutdu bağ ara, kül rəngi bülbül guya ki,
Ey Hüseyni, onu bu odlu fəğanım örtədi.

### ❧ 183 ☙

Gecə hicrindən visalına xəyalım var idi,
Heç kimə deyə bilməm kim, nə halım var idi.

Bilü ağzının hədisin şərh ədənə, ey həbib,
Xurdabinlər birlə hər dəm qeylü qalım var idi.

Yaxa yırtıb, çak edib köksüm, başıma daş urub,
Ağlar ərdim dəmbədəm ta kim, məcalim var idi.

Çünki gəldim özümə fəryad edib, çəkdim fəğan,
Həm itindən, həm özümdən infiqalim var idi.

Baş qoyub, canım fəda edib itinin alnında,
Eylədim vəqti bunu kim, etidalım var idi.

Qətlin ümidi həzin könlümə bir dəm girməsə,
Hər zaman yüz qatla ölmək ehtimalım var idi.

Vədeyi-vəsl olmasa hicri ara mən xəstəyə,
Ey Hüseyni, harda can vermək xəyalım var idi?

**184**

Eşqim odundan, gəlib, Məcnun bir uçqun istədi,
Al dedim, sunğac əlin başdan ayağın örtədi.

Çün eşitdi Vamiqü Fərhad Məcnun köyməsin,
Gəlibən görgəc iki, heyrət oları çürkədi.

Qalmadı ol yar köyündə yeri, qan olmayan,
İtləri məcruh cismimi çü hər yan südrədi.

Xəstə könlüm dəlməyindən qanmadı tiği onun,
Gərçi  hicran quşlarına  bir-bir onu doğradı.

Gər qəmin çıxdıyü, nə əğyar mehri tapdı yol,
Navəkin peykanı ta könlüm şəqafın tügrədi.

**185**

Heyrətim var, ta qara qılmış libasin ol pəri –
Kim, qaranğu tündə görmüş aftabi-xavəri.

Şərt ərər çün hər kişi öz yarına həmrənglik,
Tutdu cismimi qara dud üzrə könlüm azarı.

Ol qara yeldə tünündən, vah, nə çıxınca quyaş,
Yer üzün göy tək müzəyyən qıldı əşkim əxtəri.

Aya mane oldu bu şəbxun duman, yüz şükür kim,
Yetib ahım yeli, qıldı ol dumanı bir sarı.

Vardır ümidi Hüseyni təşnə ləbin, kim yenə
Dərdi-hicran dəf olub, edə visalın kövsəri.

**❧ 186 ☙**

Qılmaya ərdim üzün görmək təmənna kaş ki,
Salmaya ərdim könül mülkünə qovğa kaş ki.

Vəsl ara düşdü könül mülkündə qovğa, ey rəfiq,
Qıla ərdi hicr odu könlümü yağma kaş ki.

Tanrı üçün tilbə könlümü itirgil, ey sipehr,
Kim, iməs hasil bu bihasildən ala kaş ki.

Eşq ara rüsva olub mən bu təəssübdən nə sud,
Ya diriğidir hər işin zimnində ya kaş ki.

Ol quyaşın nəqdi vəsli gərçi rahatdır, vəli
Qılmaya ərdi könül onu təmənna kaş ki.

Mən ki ol ay eşqini qıldım təmənna, ey könül,
Qıla ərdim zöhd içində dideyi-bina kaş ki.

Çün Hüseyni dövləti-tövfiq səndən istədi,
Uşbu işdə salma könlünə xudaya kaş ki.

## 187

Vardır ol şəbxun libas içrə pəri, ya adəmi,
Ya məgər kim göz qarasında ərər göz yordamı.

Gər gözümün mərdümi ərməs durar, pəs nə üçün
Əşk axıb bildirər hicran qəmindən matəmi.

Axsa əşki-hülleyi-şəbxun ara, vah, nə əcəb,
Gün qara bulud ara girgəc, olar zahir nəmi.

Derlər: ölməz zülmət içrə abi-heyvan tapan el,
Vah ki, mən tapıb mənü, canım alar hər dəm qəmi.

Ey Hüseyni, bu qara qayğında canın olsa riş,
Qəm yemə, bir gün dəva qılar visali-mərhəmi.

**188**

Canda aydar mən: düzəm hərfi-qəmin təhririni,
Könlüm olmaz, vah ki, bilməzəm bu iş tədbirini.

Bavər etməz ərdim el dərdin, vəli qəm görəli,
Çin xəyal eylərəm elin naleyi-təzvirini.

Afiyət küncün tutaq derəm qurtulıb eşqdən,
Vah ki, özgə qılsa olmaz tanrının təqdirini.

Dedim asayiş tapam eşq içrə, vah, müşkül dürur,
Sən pəriru eşqində qılmaq bu söz təqririni.

Vala olmuş vah Hüseyni yar ram olsun debən,
Tilbə olanlar kimi istər pəri təshirini.

**189**

Görəli sən zülfi-meygün, gözləri məstanəni,
Örtədi eşqin odu axır məni-divanəni.

Bixəbər ol zülfdən, can verdi könlüm xalına,
Bilmədi divanəlikdən dam içində danəni.

Gər görüb nagah üzünü ölsəm, ey can, nə əcəb,
Aqibət çün şö'leyi-şəm' öldürər pərvanəni.

Qisseyi-dərdimi gər zülfünə desəm eyb iməs –
Kim, uzun tünlərdə der olar kişi əfsanəni.

Ta yaratdı haq təala dünyada hüsnü cəmal,
Görmədi dövran gözü bir sən kimi cananəni.

Künci-möhnət içrə tapdı ay üzün mehrin Hüseyn,
Gənc əgər istərsən, ey can, qoyma bu viranəni.

**190**

Gül üzü yadı qılım, ya ol xətti-reyhanını,
Vəsli-əyyamınmı deyim, ya qəmi-hicranını.

Övrülüb başına qoydum hicr vadisinə toprağa üz,
Vah ki, bir saqınmadı hərgiz bu sərgərdanını.

Nəqdi-eşqin kim, pozulan könlüm içrə qoydu can,
Əsrü məmur eylədi ol gənc ilə viranını.

Ox ki atdın köksümə, gərçi tənimə oldu zə’f,
Can bilə könlüm dalaşdılar onun peykanını.

Gül üzün şövqündə qəm dəştini qıldı laləzar,
Tiği-hicrin tökdü çün hər sarı bağrım qanını.

Hüsnünə ol növ’ heyranam ki, heyran qaldılar,
Gördülər Fərhadü Məcnun çün onun heyranını.

Ey ki cəbrim navəkin könlündə dersən kim, sana,
Yağdı ondağ kim, yəqin kəm biləm onun sanını.

Hüsni-dövrünə vəfa çün yox, qənimət tut bu gün
Həm vəfa ayinini, həm xubluq dövranını.

Nalə eylər ərdi eşqində Hüseyni yaşırın,
Hicrin etdi aşikar ol naleyi-pünhanını.

## ☙ 191 ❧

Vah ki, qəm dəştində itən natəvan könlüm hanı?
Tərki-canım eyləyən bixaniman könlüm hanı?

Nə nişanından xəbər tapdım, nə adından əsər,
Hicr vadisində binamü nişan könlüm hanı?

Demə kim, canına aram istəsən, tapşır könül,
Sən əvvəl görən tək, ey arami-can, könlüm hanı?

Lütflər qılmış cahan rüsvası üşşaqına yar,
Vah, bunun tək çağda rüsvayi-cahan könlüm, hanı?

Yel saçar gül bərgi-bostan içrə ol ay başına,
Bu mahalda damla tək bir qətrə qan, könlüm hanı?

Sən xud dersən ki, eşq içrə gərək könlünə səbr,
Səbr edənə, ey rəfiq, mehriban könlüm hanı?

Ey ki, dersən kim, Hüseyni özgəyə vermiş könül,
Özgəyə vermək üçün, ey bədgüman, könlüm hanı?

## ☙ 192 ❧

Ey əcəl, asudə qıl hicran bəlasından məni,
Bir yolla qurtar ulusun macərasından məni.

Zə’fim aşdı hicr bağında sirişkü ahdan,
Qurtar, ey vəsl, ol çəmən abü həvasından məni.

Ey əcəl, qorxuzma öldürəm debən, öldürərsən
Gər diri tapsan fəraqın cəfasından məni.

Eşqü rəşkü hicri-mühlik, vah, ona canım fəda –
Kim, çıxarar bu bəlaların arasından məni.

Hər necə ötsə də həddən müddəi bidadü zülm,
Ötürə bilməz visalın müddəasından məni.

Der ki, səbr etgil həkmi-aqil, qılgil, saqiya,
Bir qədəh birlə xilas onun dəvasından məni.

Ey Hüseyni, səltənətdən onca fəxrim yox dürur,
Kim deyələr: köyünün heyli-gədasından məni.

**193**

Növbahar oldu, açılmaz, vah ki, eyşim gülbüni,
Qəm xəzanı yelindən sovruldu səbrim hirməni.

Mən ki, bir rüxsari-qamət həsrətindən mən həlak,
Nə xeyri, canımda gülşən ərğüvanı, süsəni.

Lalə birlə sünbülü sirabdan təskini yox,
Ol izari-zülf, odu, dudi çün yaxar məni.

Nişi-qəmzəndən tikan birlə tutulan yaxşıraq
Gülşən içrə gül birlə dolunca köksüm rövzəni.

Naləli könlüm çürük olan süyəklər içrədir,
Öylə kim, xəşək içrə olsa bülbül məskəni.

Yüz vəfa qılsan, cəfa görsən təəccüb qılmagil
Kim, bu ayindir əzəldən aləm əhlinin fənni.

Olalı aşiq Hüseyni həm gədadır, həm zəbun,
Eşq ara sud etmədi şah, ya mübariz ərgəni.

**194**

Düşəli suzani-könül köyün ara, filhal onu,
Yerə düşən od idi kim, eylədin paymal onu.

Könlüm öz halında qalmaz cilvə qılğac qamətin,
Vah, nə hal ərkən bu kim, eylər qəddin bihal onu.

Bu ki, qafillər cəfasından qaçar şeyda könül,
Tilbə təkdir kim, qovarlar daş urub ətfal onu.

Xamədir cismim vəli, can riştəsin gör yaxşı kim,
Zə’f ilə tovlanmağından desə olar nal onu.

Görməyə ərdim onu hərgiz çü ağlab sali-mah,
Görməz ərmiş mən ötüb hicrində mahi-sal onu.

Gülşəni-dövranda xoşdur badeyi-gülgün vəleyk,
Saqiyi-gülrux dəmadəm tutsa mala-mal onu.

Hər məqam içrə Hüseyni eşq ləhnin saz edər,
Qılmasa rüxsarına nəzzarə günu lal onu.

### ঌ 195 ও

Səbzeyi-xəttin xəyalı birlə ölsəm, ey pəri,
Səbzeyi-qəbrim nə eyb gər bitsə hicran nəştəri.

Öylə cənnət səbzəsi yanlığ xəttin məşufi,
Kim gərəkməz cənnəti-minayü qəsri-əhzəri.

Səbzə tək kim, zinəti gülbərg ərər, ol növ’dür,
Lə’lin üstündə zümərrədgün xəttinin zivəri.

Ləblərin şövqündə kim, od düşdü məhzun canıma,
Atəşin lə’li dürur ol şö’lənin hər əhgəri.

Zə’flik cismim hərarətdən tutuşdu ol sifət –
Kim, yapıncı ona dudi-kül olubdur bəstəri.

Səbzə üzrə, saqiya, cami-zümərrədgün gətir –
Kim çəkər ol xətt xəyalı birlə işrət sağəri.

Gər Hüseyni eşq ara divanə olsa nə əcəb –
Kim, pəri-peykər, mələk sima igiddir dilbəri.

**196**

Necə kim, çəkər könül dərdu-qəmu-azarını,
Mehrim artar necə kim, görsəm mahi-rüxsarını.

Məndə mehri bu sifətdir, vay kim, ol bağrı daş
Bivəfa eylər güman bu xəsteyi-əfgarını.

Şövqündən ahım fələyə yetdi guya kim, bilib
Bilə, bilməzə salar, mən xəsteyi-hal zarını,

Gül ki, rüxsarına şəbnəm töksə dərdi-eşqindən,
Niyə xar edər cəfadan bülbülü-bimarını.

Vəsl ara, qeyrət Hüseyni canına od yaxdı kim,
Nəyə can tapar liqasın, ya ki göz didarını.

### 197

Ey fəraqından gözümün yaşü qan tökmək fənni,
Kim ərər həm lə'li-kani, incinin həm məxzəni.

Nalələr məqdursuz kim, zahir etdim şami-hicr,
Vah ki, naləm odundan örtəndi səbrim xirməni.

Şami-zülfündir çü könlümə şəbistanı visal,
Arizindir ol şəbistanın çırağı-rövşəni.

Suzi-hicrindən kim, oturdum qara topraq ara,
Görən deyər kül ara divaneyidir-gülxəni.

Xətti bənövşə, zülfi sünbül, çeşmi nəsrin, çöhrə gül,
Nə riyahın birlə tapmış zib hüsnün gülşəni.

Köynəyin gülgünmüdür, aya xuraman qədd bilə,
Ya ərər gül bərgindən sən sərvinin pirəhəni.

Gər gədayindir Hüseyni, nə əcəb, neyçün ki var,
Eşq ara mən müflisü, sən hüsn mülkündə qəni.

**198**

Özgəcə fəryad edərəm hər zaman hicran tünü,
Olmaz ərmiş itən itin hicr ara bir tək ünü.

Öylə bir ay hicrindən könlüm köyər kim, guya ki,
Çərx onun dudi dürur, kövkəblər onun uçqunu.

Seyli-əşkim yer üzün tutdu, sayan ərgən zaman,
Yox əcəb, gərdunu qılsa qərqə onun özünü.

Yaxdı can birlə tənimi tiri-barani-fəraq,
Vah, nə qat-qat yerdən ötdü ol yağının ötgünü.

Toxdada bilməm özümü ağlamaqdan hicr ara,
Görsə bu halımı ol gül əsray almaz gülgünü.

Çün lətafət gülbünüsən, çöhrə aç, tanrı üçün –
Kim eyb ərməs böylə gül açmaq lətafət gülbünü.

Yerdə seyr eylər Hüseyni üzünə sunmaz ayaq,
Dəng iməs alnında topraq birlə onun altını.

## 199

Hüsn iqlimində sən tək dilbəri-rə’na hanı?
Dövri-hüsnünə mənim tək aşiqi-şeyda hanı?

Gözümə aləm qaraldı, ol quyaş üz hicrində,
Ol pərivəş sərvi boylu, mah cəbin, aya hanı?

Sənsizin çox ağlamaqdan yetdi iş ol yerə kim,
Sumudur bilməm gözümdən axa duran, ya qanı?

Qəmzən oxunu utanma at, məni-dilxəstəyə –
Kim cərahətli könlünün mərhəmidir yağanı.

Unudub nagah Hüseynini rəqibdən sorasan –
Kim, mənim eşqimdə olan valayü rüsva hanı?

## ☙ 200 ❧

Harda istər istəsəm, hardan tapam sən yarı?!
Kim mana həmdəm olub, sora dəmi-mən zarı.

Hər səba kim, gəlsə səndən can verər ol rəhm edib,
Necə əsrəyər dirilik sağüyü, bu bimarı.

Qəmdə mən kim, vəsl ara nedib üzünü görəm,
Kim ağıdan kor edib mən dideyi-xunbarı.

Toxtamaz cənnətdə, müjganın dilər könlüm quşu,
Bəh görər bülbül cəvahirli qəfəsdən xarı.

Öldürər rəşk, ey Hüseyni, yoxsa der ərdim bir öp,
Görsən, ey badi-səba ol sərvi gül rüxsarı.

# TƏXMİSLƏR

## NEDƏK

Lə'li-canbəxşindən ayrı abi-heyvanı nedək?
Hər dəm gər yüz can verər, cananəsiz canı nedək?
Gər iməs mənzur üzün, huri, qılmanı nedək?
Gülşən köyündən ayrı baği-rizvanı nedək?
Başıma gər gül saçar, sənsiz güləfşanı, nedək ?

Hicr ənduhində ta gülşən ara qıldım güzər,
Sərvi boyu qamətinin nəxlindən verdi xəbər,
Leykin onun vəslindən nə bəhrə tapdım, nə əsər,
Nəxli-qəddin çün iməs giryan gözümdə cilvəgər,
Cuybar ətrafında sərvi-xuramanı, nedək?

Cismü canı istəməm, billah ki, canandan cüda,
Görsən ol məhvəşi halım ərz edib de, ey səba,
Leyk zinhar alnında bu növ' qılarsan əda,
«Ol itinə olmasa tö'mə, bu alnında fəda,
Zə'flik peykəri neylim, natəvan canı nedək?»

Bir dəm, ey əhbab, hər sarı qaşımdan getməniz,
Hər nə kim, derəm, müvəccəh olmasa eşitməniz,
Bu ki derəm, çöhrədən qanlı yaşım axıtmanız,
«Lə'lgün əşkim, ləbi-hicranında eyb etməniz,
Göz yolundan tökməyin, bağrımdakı qanı nedək?»

Bu əcəbdir kim, sana mə’lum olmalıdır bu sirr,
Kim ərər mən lə’li-şövqündən ölümə müntəzir,
Gər soyundan hər nəfəs bir cam versən, var müzir,
«Zülməti-hicrində çeşmən vəsfin etmə, ey Xızır,
Mən ki, ömrümdən doyub, mən abi-heyvanı nedək?»

Söz əlacımdan demə, ey bəhri-eşq içrə qəriq,
Kim olubdur deb qəmindən dağ ilə cismin xəriq,
Gər mana varsan mühibbü müşfiqü yarü şəfiq,
«Dağıma mərhəmi çox təklif qılma, ey rəfiq,
Tutdum, ol dağım onaldı, daği-hicranı nedək?»

Ta ayırdı məndən ol məhvəşi çərxi-kəc nihat,
Ey Hüseyni, tilbə könlüm olmadı bir ləhzə şad,
Aqibət çün tapamdım ol şux vəslindən murad,
«Yardan ayrı pozuq könlümə qıldım xeyir bat,
Ey Nəvai, elə gənc olmaz bu viranı nedək?»

## QILDI -LA

Cəbrü zülmün, vah, yenə canıma gərdun qıldı-la!
Yaşırıb ol ayı, halımı digərgun qıldı-la!
Ahü vaveyla məni əsrü ciyərxun qıldı-la!
«Ol ciyər pərkaləsi əşkim ciyərgun qıldı-la!
Şad edək deb natəvan könlümü məhzun qıldı-la!»

Ol ki var ərdi həyatım çeşməsinin kövsəri,
Yox, yox, ərdi baği-ömrüm nəxlinin türfə bəri.
Mən xud ərdim şövqünən Məcnunü, ol həm bir səri,
«Vədə edib cilvəsin bağ içrə andağ kim pəri,
Dəşt üzə avara qılmaqlığa Məcnun qıldı-la!»

Ol ki der ərdi visalımı sana həmdəm qılam,
Çaklər bağrında kim olmuş ona mərhəm qılam,
Əksildib dərdü qəmin bundan varı xürrəm qılam,
«Dedi: vəslim birlə çoxdan çox qəmini kəm qılam,
Onu gündən-günə əksiltməkdən əfzun qıldı-la!»

Vədeyi-mehri-vəfa edib, bu xun ağuştəni,
Sad qıldı, zülfi-damına çəkib sər riştəni,
Qan yaşımdan laləgün çün qıldı bağü püştəni,
«Qurtaraq deb çərx cəbrindən mən sərgəştəni,
Əncümü peykan bilə cismimi gərdun qıldı-la!»

Üzünə heyran gözüm çöhrə nəmudar edəli,
Alnında lal ərdi dil, lə’lin şəkərbar edəli,
Qəddinə mail, xirəd ahəng rəftar edəli,
«Zülfünə vəhşi könül saydın giriftar edəli,
Yox ağızdan var əkəncə həddi-əfsun qılda-la!»

Doğrayıb bağrımı ol ay hicrində tiği-sitəm,
Göz yolundan yaş ilə axızdı onu dəmbədəm,
Əşki-lə'lü dərdindən bihədd olub mən möhtəşəm,
«Müflis ərdim mey qılıb, sınan sifalım cami-Cəm,
Xatirim viranəsin xud gənci-Qarun qıldı-la!»

Bu ki şeyxi-şəhrimizi xalq der: ağıl bəsi,
Zöhdü təqvayü fəzail birlə həm kamil bəsi,
Ey Hüseyni, leyk ərər bu iş mana müşkül bəsi,
«Kim Nəvaidən səlah istər ərər qafil bəsi,
Xirqeyü səccadəsin ol meyə mərhun qıldı-la».

## MÜXƏMMƏS

Çərx tək mehrin əlindən eylərəm mən dadı hey,
Çünki qıldı bizi qəmgin, özgələri şadı hey,
Neçə illik aşnamız oldu bizdən yadı hey,
Sərnəgün olmuş, yatır ol qaməti-şümşadı hey,
Cənnətin bürcündəki tubumu yıxdın, badı hey.

Firqət əyyamında Məcnun bunca çox laf urmasın,
Hicri-dərdi-dağını heç kimsə məndən sormasın,
Mərd əgər töxmün əkib bir bimahal sövq urmasın,
Tez götürün cismini, çıxsın ki, çeşmim görməsin,
Tabutun tizrək yonub, göndiri ver xarratı hey.

Yarın kim, qıldı səfər, hicrana dözsən, vəqtidir,
Firqətindən yaş döküb, bağrını əzsən, vəqtidir,
Yaxşıların hüsnü vardır, bir gül üzsən, vəqtidir,
Leyliyü Məcnun sifət divanə gəzsən, vəqtidir,
Canı Şirinin çıxıb, çıxsın gözü Fərhadı hey.

Hafizi tək köksünə daş urmadın, Sultansöyün,
Axdırıb əşki-rəvanın yürmədin, Sultansöyün,
Ol ki, təslim qıldı can, sən qılmadın, Sultansöyün,
Yar bilən bir gora neyçün girmədin, Sultansöyün,
Taki dünya var ikən qalardı səndən adı hey.

## RÜBAİLƏR

Görkəzmə çəməndə sərvi yoldaş mana –
Kim görəndən gözdən axar yaş mana,
Endirsə nə olar bir nəfəs baş mana,
Ol sərvi-rəvan ki, oldu boydaş mana.

* * *

Ol qəmzə ki, bağrım oldu əfgar ondan,
Hər ləhzə ərər zəifü bimar ondan,
Lə'lin ki ərər, xəstə könül zar ondan,
Neylək ki, sana var ərmiş azar ondan,

* * *

Ol şux ki, bir dəm mana həmdəm olmaz,
Zəxm ursa dəxi vəslinə mərhəm olmaz,
Eşqində könül nəsibi cüz qəm olmaz,
Könül götürə desəm, könül həm olmaz.

* * *

Ey çərxi-cəfagər, nə sitəmlər qıldın?
Canımı nişaneyi-ələmlər qıldın,
Mühlik nəbsim odun aləmlər qıldın,
Üzrünü necə qovum, kərəmlər qıldın?

* * *

Ağlama, ey göz kim, ol sərvi-səmənbər gələcək,
Köyməgil, ey can ki, ol xurşidi-ənvər gələcək,
Ey könül, bimarlıqdan qəm yemə kim, başına
Bir Məsiha tək hədisi-ruhpərvər gələcək.

* * *

Əşki-tufanı əgər cismim götürdü köyündən,
Ah kim, ta göz yumub açdım çıxardı köyündən,
Yox ki, sürdü köyündən ol sel mən avarəsin,
Nəxli-ümidim, nihalın həm qopardı köyündən.

## QİTƏLƏR

Vah ki, bir cəlladvəş qanım tökər, eylər sitəm,
Qorxaram qanım tökəndə tapmaya tiği-ələm.

***

Olsa yüz canım fəda, lə'li-şərab aludinə,
Cismi-bimarım həm olsun çeşmi xab aludinə.

***

Görəli həmmam ara ol ay qaşi-peyvəstəsin,
Eylədim eynimi tasü qaşlarımı dəstəsin.

***

Od çıxardı eşq təndən, vah ki, candan dərdi-hicr,
Eşq dərdi mühlikü mühlirək ondan dərdi hicr.

***

Sünbülünə ver Xıtayı, məndədir müşki-Xotən,
Gər dəlil istər isən, vardır libas yarağı.

***

Ol pəri gözdən çü məxfidir, həmişə, vah, necə
İstər onu, tapmasa Məcnun könlünü yandırar.

## RİSALƏ

**(qisa ixtisarla)**

Pak və bülənd tanrı bu pəs bəndəsinin sultanlığı zamanında bir neçə kişiyə xoşbəxtlik bəxş edibdir və bu fəqir isə məclisində onların hüzurunu yuxarı tutubdur. Oların varlığından isə bu dövr əhli-zamanlardan yuxarı və bu zaman bütün dövrlərdən artıq olub, bunun özü həm çox şükürlər etməyə əsasdır, vəli ondan sözləycinin dili laldır və qələm dili şikəstəhaldır. Onların ən elmlisi və əfzəli elm dənzinin pak dürrü, vəlilik fələklərinin şö'lə saçan günu, qoşqu gövhərlərinin düzüm yiyəsi həzrəti şeyxülislam Mövlana Əbdürrəhman Camidir (qoy Allah-təala ona sağlıq versin və saxlasın!). Bərklik və fırlanış məkanında yüz min göz ilə aləm əhlinə seyr edən bu qədimi bünyadlı fələyin gözünə bunun kimi nadir fikir-xəyallı rast gəlməmişdir. Cahanın başına fırlanan aləmi görkəzən günəşin, bəlkə də fələkləri fırlanan günəşin şö'ləsi hərgiz onun tək taysızın üstünə düşəmişdir. Qoşqu gövhərlərindən cahan sədəfi qiymətbahalı dürdən doldu, qissə ləllərindən atlas fələklərə zinət və bəzək verildi. Dürlü elmlərdəki əsərləri sansız və hər əsərində mə'na xəzinələri hüdudsuzdur.

**Şeir**

*Çü mizan təbi olub gənc sənc,*
*Ona bir tərəzi gəlib pənc gənc.*

*Ki heyran qalıb, nəzm qılan çağı,*
*Ona yox ki Xosrov, Nizami dəxi.*

Qəzəlləri coşdurucu, beytləri çox bədiidir. Pak və bülənd tanrı çox illər onun yol görkəziçilik sayəsini davamlı, bu davamlı dövlətə isə onun tək dövlətlini həmişəlik tutsun. Qoşqu düzücülərdən bədii dillilik övcünün Süheyl ulduzu ola bilən başqa kişilər də var [ki,] qoşqu dastanının bədiiliyində, düzümünün bərkliyinin bəyanı ilə əhəmiyyətlidir. Onlar tək fələk üz verən deyildir. Hazır həm heç yerdə onlar tək kişi görünən deyildir. Heratda (Allah-təala onu afətlərdən qorusun!) və onun ətrafında

könlə gəlişinə görə, şöylə də sözləri doğru və xəbərli kişilərin arzumuza yetirişlərinə görə, işləri – mə'na dürlərini düzüm çızığına çəkmək və diqqət gövhərlərinə vəzn libasının zinət və bəzəyini verən təxminən minə yaxın kişi var. Heç bir dövrdə elin minindən onu və heç vaxt yüzündən biri bunlar tək olmamışdır. Bu adı bəyan edilənlər və vəsfi yazılanlar farsca qoşqu düzüş məclisində bəzm quran və farsca yazış dənizinə tanışlıq görkəzən kişilərdir**.** Əmma bu günə qədər heç kişi mə'na qızlarına türkanə libas geydirən deyildir və ol nazəninləri bu ziba xələt ilə görünüşə görkəzməyə gətirən deyildir, həm də bu müşk ətirli rə'na gözəllər pünhanlıq öylərinin təbiətində çılpaqlıqdan yana örtüklü qalandırlar. Bu huri şəkilli gözəllər hülləsizlikdən yana naz cilvəsini edə bilməmişlər. Bu bəxtiyar zamanda və bu mübarək dövrdə bu natəvan olan mənim bayrı el-günümdən və sadə xalqımdan qulluq qatarından gögəldaşlıq (süd qardaşı – R.Ə.) dərəcəsinə yetən, xidmət ediş yörəlgəsindən söhbətdəşlik sərmayəsini kəsb edən, hərəm kəbutəri tək xəlvət pərdəxanasında məhrəm olan, şərab ördəyi tək gecə söhbətində həmdəm olan, haq sözü deməkdən çəkinməyən Nəvai təxəllüsü ilə məşhur və şeirlərində bu təxəllüsü yazan Mir Əlişir (Allah-təala şan-şöhrətini artırsın!) türki dilin ölən cəsədinə İsa dəmi ilə ruh verdi. Şol ruh tapanlara türki yörəlgəli sözlərin tarlarından və ipəklərindən toxunan hüllələri və qiymətbahalı xələtləri geydirdi. Söz gülüstanında növbahar qəlbindən axıb gələn yağıntılar ilə rəngbərəng güllər açdı. Qoşqu dənizinə fikir buludundan ruhlandırıcı damcılar ilə dürlü-dürlü dürlər saçdı. Hər sinif şeir meydanında at çapdırsa, ol yurdı dil qılıncı ilə öz əlinə keçirdi. Onun nəzminin-qoşqusunun vəsfində dil kəltə və bəyan acizdir. Onun şu göstərilən mə'nadakı məsnəvilərindən bir neçə beyt könlə gəlir. Ol şudur:

**Məsnəvi**

*Mən ol mən ki, ta türk bidadıdır,*
*Bu dil birlə ta nəzm bünyadıdır.*

*Fələk görmədi mən kimi nadiri,*
*Nizami kimi nəzm ara qadiri.*

*Nə nəzmidir ərsəm məni dərdnak*
*Ki, hər ləfzi ola onun dürrü pak.*

*Xuda yetirər anca surət mana,*
*Ki olmaz bitirəm fürsət mana.*

*Bu meydanda Firdövsi ol gərd ərər*
*Ki, gər gəlsə Rüstəm cəvabın verər.*

*Rəqəm qıldı fərxundə «Şahnamə»yə*
*Ki, sındı cəvabında hər həmayə.*

*Müsəlləm durar guya ki bu işi*
*Ki, müriz gəlməz durar hər kişi.*

*Dedi öz dili birlə ol kani-gənc*
*«Ki, si sal bordəm bə «Şahnamə» rənc».*

*Onu derə olsa haçan rəğbətim,*
*Ərər anca haq lütfündən qüvvətim.*

*Ki gər neçə təb kəfil olsa saray,*
*Bitirər mən otuz ilin otuz ay.*

*Əgər xas mə’na gər eyham ərər,*
*Onun gündə yüz beyti həlvam ərər.*

*Nə «Şahnamə» kim, «Xəmsə»yə ursam əl,*
*Onun pəncəsi sarı yetirsəm əl,*

*Ümidim bu kim, eyləbən fəthi-bab,*
*Qolum verəm ol pəncəmə dəxi tab.*

*Otuz ilə onu nizam demiş,*
*Qaşımda ərər iki-üç illik iş.*

*Haçan onu der, bəzmi düzər mən,*
*Deməyi xəlayıqə görkəzər mən.*

Bu beytlər onun qəlbindan baş urub çıxan vaxtlarında ilk başda el qaşında şairanə laf urmalar və öygülü yanramalar olub görünərdi. Həqiqətdən də, ol bu bəxtiyar fürsətdə və bu gün-gündən artan dövlətdə «Xəmsə»nin pəncəsinə əl urdu və onu qutarmağa ixlas-təala etdi. Şeyx Nizami qoşquçu xəlayiqin ustadı olsa da, öz «Xəmsə»sini bəlli olduğuna görə, otuz ildə tamamlayıbdır. «Xəmsə»nin beytlərinin sayını otuz mindən on səkiz minə qədər qısaldıb düzən Mir Xosrov (Dəhləvi – R.Ə.) isə məşhur oluşuna görə, altı-yeddi ildə qurtarıbdır. Bu bədiilik meydanının yenilməz batırı, süxənvərlik cəngəlinin şiri isə çox əfsanələrə – ərtəki – hekayələrə könül çəkici təfsirlər və könlə yatan düzəlişlər verməyinə baxmadan, bünyadının başlanğıcından axırına qədər hamana iki ildən ötmədi. Deyilən vaxtlar hesaba girsə, altı aya yetmədi demək mümkündür. Onun əfsanələrinin rəngbərəngliyini, beytlərinin cadulayıcılığını, düzümlərinin bərkliyini və mə’nalarının nəfisliyini oxuyan kişi bilər və görən kişi anlar.

Yenə məsnəvi üsulunda deyil, bəlkəm ərəb süxənvərlərinin və əcəm bədii sözlülərinin bəzək verən və divan edən hər dürli qoşqu görünüşlərinin əhlisinə bu həm qələm sürtüb, onlara həmlə urubdur. Onun bəyanı divanının fihristində – məzmununda bəyan ediləndir və yazılandır. Yox, divan deyil! Allah, Allah! Ol sapı-qatarı sözlərdən dolu gövhər olan cəngdir və pak mə’nalardan dolu ulduz olan fələk vərəqləridir.

*Demə divan, qəmü dərd əhlinə afət de onu,*
*Köyməkü şö’leyi-qəm birlə qiyamət de onu.*

Hansı qoşqusu eşq əhlinin canına od urmaz, hansı məzmunu hicran qoşununun cismini köydürməz, bəlkə külüni göyə sovurmaz?! Hansı misrası fəraq ciyər xununun bağır qanını damdırmaz, hansı sözü hicran biçarəsinin göz yaşı seli ilə səbr-qənaət qoşununu axdırmaz?! Nəzm-qoşqu iqlimində hansı gürganə- qala köç gətirəndə özünə qarşı eşik açılmadı?! Hansı ulu yurda qəlb-şeir qoşunu ilə çapovulluq edəndə onu basıb almadı?! Bu gün nəzm-qoşqu sütunlarının yer üzündə qəhrəman odur. Onu bu yurdları basıb almağın sahibgiranı desək olar.

**Şeir**

*Ərər söz mülkünün kişvər satanı,*
*Hanı kişvər satan Xosrov nişanı.*

*Demə Xosrovnişan kim, qəhrəmanı,*
*Ərər gər çin desən sahibgiranı.*

Bunun kimi əcaib əsərlərin və tazə görünüşlü qoşquların coşqun-daşqını bu dövlətdə və şö'lə salışı bu sultanlıqda oldu. Pak və bülənd pərvərdigar onu bu fələk misilli dərgahın qulluğunun ixlascanibkeşi və bu fəriştə xasiyyətli həlim zatın öygüçülərinin keşikçisi etdi. Bu da çox şükürlər etməyə əsasdır.

**Rübailər**

*Ya rəb, hansı şükrünü əda qılım mən,*
*Nə dil bilə onu ibtida qılım mən.*
*Yüz canım əgər olsa fəda qılım mən,*
*Desəm ki, əda oldu, xəta qılım mən.*

*Ya rəb, məni qulluğuna qadir eylə,*
*Gər yetsə bəlayü dərd, sabir eylə.*
*Yadına dəxi içimi təhir eylə,*
*Əncamına həm dilimi zakir eylə.*

Sultan Hüseyn Mirzə Bayqaranın risaləsi dolu xeyir bilən tamam oldu. Pəs və fəqir Əliverdi bin Söhbətqulu.

# SÖZLÜK

**–A–**

Ab – su.
Abi-həyat – dirilik suyu.
Adəm – yox, yoxluq.
Afəriniş – yaratma, törətmə.
Aftab – gün, günəş.
Afiyət – sağlıq, bəxt.
Ağaz – başlama, girişmə.
Ahən – dəmir, metal.
Ahəngi-şəfaət – şəfaət niyyəti.
Aqibət – axır, son, nəticə.
Aludə – bulaşmış,batmış, aşiq, vurğun.
Afət – bədbəxtlik, bəla; sevgili.
Arayiş – bəzək.
Ariz – ərz edən; sərkərdə; şikayətçi; hadisə, vaqeə; üz; sayə salan bulud.
Asığ – fayda, nəf.
Aşam – içmə; dadma.
Aşiyan – yuva; ev.
Aşub – qovğa, gurultu; fitnə.
Aşuftə – biqərar, həyəcanlı; aşiq.
Atəşəngiz – odlu, yandıran.
Ayaq – badə, şərab piyaləsi.

**–B–**

Badə – şərab, çaxır; kasa, piyalə.
Bais – səbəb, əsas.
Bak – qorxu.
Bal – qanad, pər.
Batraq – cəld, tez.
Bavər – inam, inanc, inanma, etqad; kifayət.
Beayna – adil, doğru; eyni.
Bəcüz – başqa, əlavə.
Bəd əz in – bundan sonra.
Bədəl – əvəz.
Bəh – xoş, yaxşı.
Bəhr – dəniz; əruz ölçüsü.
Bəxil – bağışlama, bəxş etmə; paxıl; xəsis, simic.

Bəliyyət – bətbəxtlik, cəbr, cəfa, bəla.
Bəni-adam – adəm oğlu,bəşər.
Bənd – bağlı, bağlanmış; dustaq.
Bəqa – baqi, həmişə, müdam.
Bərq – ildırım, od, qığılcım.
Bərg – yarpaq.
Bərhəm – qarışıq, dağınıq, pozğun.
Bərr – yer, səhra, düz, çöl.
Bərtərəf – aradan çıxan, yox olan.
Bəsər – görmə, göz.
Bəstər – döşək, yorğan-döşək.
Bədxuy – pis xasiyyətli.
Böyükrək – Allah-təalanın bir sifəti; Allah-təala, tanrı, xuda.
Beytül-əhzan – qəm-qüssə evi.
Bəhrə – fayda, xeyir.
Bəhrəmənd – bəhrə alan; bəxtli.
Bəhrəvər – faydalı.
Bəzm – məclis, toy, toplantı.
Bəzmara – toyun bəzəyi, yaraşığı.
Bidar – uyğusuz, oyaq.
Bidad – ədalətsizlik, zülm.
Bidil – ürəyini qapdıran; qayğılı; aşiq.
Bihəmta – taysız.
Bihəd – hədsiz, hədsiz-hesabsız.
Binəva – qərib, köməksiz, bəxtsiz.
Büryan – yanan, qovrulan, bişən, dağlanan.
Bisyar – çox.
Bişümar – saysız-hesabsız.
Bu (buy) – iy, xoş iy.
Bütmək/bitmək – bitmək, göyərmək.
Bürkəmək – bürkülmək.

**–C–**

Canafərin – canı törədən, Allah.
Canbəxş – can verən, Allah.
Cavidan – həmişə, daim, müdam.
Cəbin – alın, üz.
Cəfaayin – peşəsi cəfa olan.
Cəm – Cəmşid. Cami-Cəm – Cəmşidin canı.
Cənah – qandal; cinah, sağ və sol tərəf.
Cəhl – nadan, axmaq, elmsiz. Cəhlü zülmət – nadanlıq və qaranqılıq.
Cəhr – açıq, açıq-aşikar, əyan.

Cəla – köç, köçmə.
Cərahat – yara.
Ciyərxun – bağrı qan.
Cilvə – naz; bəlli etmə, aşkar etmə, bəzənmə.
Cüğt – bayquş.
Cünun – dəlilik; aşiq.
Cürə – damcı, damla, udum.
Cürəriz – saqi, şərab süzən.
Cürm – günah.
Cüz – başqa, özgə, qeyri; bölük, hissə, parça.
Cüz qəm – qəmdən başga, qəmdən özgə.

**–Ç–**

Çah – quyu, çuxur, zindan.
Çak – yırtıq, cırıq.
Çakər – xidmətçi, nökər; qul, bəndə.
Çeşmeyi-heyvan – dirilik çeşməsi.

**–D–**

Damağ/dimağ – burun; beyin; kef.
Dari-fəna – yoxluq evi, dünya, cahan, aləm, fani dünya.
Dilir – batır, bahadır, igid.
Dəmadəm – dəmbədəm, durmadan, fasiləsiz.
Dəng – müvazinət, tarazlıq, bərabərlik.
Dərç –bir mətləbi-fikri kitabda yazmaq; xətt; yerləşdirmə; yazma, hesaba alma.
Dəst – əl; kömək, yardım.
Dəstar – əmmamə; çalma.
Dəstrəs – imkan, əlverişli, mümkün olan.
Deyr – bütxana; meyxana.
Dəhr – aləm, dünya.
Didə – göz.
Digərgun - özgə cür, başqa növ.
Dilxəstə – ürəyi yaralı.
Dilculuq – məhrəmlik, ürəyi ələ alma, təsəlli, könül ovlama.
Dilkəş – özünə çəkici, ürək ovlayan, məşuq.
Dilrüba – qəlb çəkən, gözəl, sevgili.
Diriğ – əsirgəmə, qıymama; əfsus, heyf.
Dud – tüstü, tütün; qəm-qüssə; dəm, dəm alma.
Dun – aşağı, alçaq; dünya, fani dünya.
Dürç – qutu, mücrü.
Düşvar – çətin, müşkül.

**–E–**

E’tidal – mülayimlik, münasiblik.
E’tiraf – boynuna alma, iqrar etmə.

**–Ə–**

Əbəd – baqi, ömürlik, həmişəlik, əbədi.
Əbna – oğlanlar; adamlar.
Əbru – qaş.
Əczü niyaz – acizlik və möhtaclıq.
Əda – yerinə yetirmə.
Əfgar – yaralı, biçarə; qayğı-qəm.
Əfğan – ah-nalə, fəğan, fəryad etmə, zar-zar ağlama.
Əflak – fələklər.
Əfsun – cadı; hiylə, məkr.
Əfşan – səpən, saçan.
Əhbab – dostlar, yaranlar, əyindəşlər.
Əhfa – gizlin, sirli.
Əhgər – köz.
Əhli-binəş – gözlülər, könül gözlüləri.
Əhli-qaza – qazavatçılar, din uğrunda savaşanlar.
Əhsən – bərəkəlla.
Əxtər – ulduz.
Əxtəri-sə’d – bəxt ulduzu.
Əhzər – yaşıl, göy.
Əks – şö’lə saçma; surət, göz önündə canlandırma.
Əqlü huş – ağıl və huş.
Əğyar – qeyrilər, başqaları; yad, düşmən.
Ələm – bayraq; nişanə; qayğı, aı.
Əlfaz – sözlər.
Ənbər –ətir, rayihə.
Əndəlib – bülbül.
Əsfər – sarı.
Əmri-mühal – mümkün olmayan iş.
Əncam – son, axır, qurtarma, yerinə yetirmə.
Əncüm – ulduz.
Ənduh – qayğı, qəm, qüssə.
Əngiz – niyyət, meyl, səbəb.
Ənvar – nur, nurlar, işıqlar.
Ənvər – ən nurlu, ən işıqlı.
Əsər – iz, nişan.
Əsrə – saxla, qoru.
Əsrəyən – saxlayan, qoruyan.
Əsrəmək – saxlamaq, qorumaq, əsirgəmək.

Əsrü – çox; ayrı.
Əsrik/əsrik – sərxoş, məs.
Əşk – göz yaşı.
Ətfal – uşaqlar, çağalar.
Ətvar – tövrlər, üsullar, hallar.
Əyn – göz.
Əz bəs ki – o qədər.
Əzm – istək, niyyət.

**–F–**

Fariq – arxayın, asudə, rahat.
Fariqul bal – rahat, asudə.
Fələk pərvizi – gün, günəş.
Fəna – yoxluq.
Fənn – görünüş; sənət, hünər; hiylə; nəğmə, saz; yol, uğur.
Fəraq – ayrılıq, ayrı düşmə, ayrı olma.
Fərib – aldatma, məkr, hiylə.
Fərsudə – köhnələn, yırtılan.
Fəsahət – yaxşı danışma.
Fəttan – fitnəçi; gözəl, sevgili.
Fəqar – onurğa sütunu.
Fəttan – fitnəçi; özünə çəkən, cazib, gözəl.
Fəza – genişlik, boşluq.
Fəzail – elm, hünər, sənət; fazilliklər.
Filhal – dərhal.
Firaq – azad olma, asudə olma, arxayınlıq.
Firdövs – cənnət, behişt.
Fiqh – şəriət elmi.
Füruş – satıcı.
Füsun – cadı, aldatma, hiylə, məkr.
Füsungər – cadugər, ovsunçu.
Fütur – süstlük, usanma, bezmə.
Füzun – artıq, ziyadə, çox.

**–G–**

Gərdun – fələk, dünya; təqdir, tale; çərx.
Gəzab – laf, aldatma, yalan sözləmə, bihudə söz.
Gəzənt – ziyan.
Gilə – şikayət, narazılıq.
Gireh – düyün.
Geysu – saç, zülf.
Gun/gün – yanaq; şəkil, usul; rəng.
Gunagun – dürlü-dürlü.

Güva – şahid; danışan.
Güftar – söz, söhbət.
Gülbün – qönçə, qızılgül kolu.
Gülqənd – gül ilə qənddən düzələn şirniyyat.
Gülrux – gül üzlü.

**–H–**

Hafa – gizlənmə, bükülmə, örtülmə, bilinməzlik, pünhan olma.
Hafi – gizlin.
Hal – durum, vəziyyət.
Hala – hazırda, indi.
Halə – ayın çevrəsində yaranan parlaqlıq.
Hami – qoruyan; dost, tərəfdar.
Heyət – şəkil, görünüş, tərkib.
Heyl – dəstə, qrup; qoşun.
Həbib – sevgili, dost.
Həbl – ip, kəndir.
Həblül-mətin – bərk ip, möhkəm bağ; səmimi dostluq.
Hədis – söz; Məhəmməd peyğəmbərin sözləri.
Həqarət – aşağılama, təhqir etmə.
Həriq – yarıq; yanan, dağlanan, bişən.
Həmayıl – çələng.
Həmraz – sirdaş.
Həmsal – yaşdaş, yaşıd.
Həmsayə – qonşu.
Hərarət – isti.
Hərif – dost, yar, həmdəm.
Həri – Herat.
Hərim – məhrəm yer, yaxın adamların gedə biləcəyi yer.
Həsəd – paxıllıq.
Həşmət – təntənə, həşəmət.
Həva – istək, həvəs, meyl, arzu.
Həzin – qayğı, qəm, qüssə.
Hicran – ayrılıq.
Hicab – pərdə, yaşmaq, bürüncək..
Hidayət – yol göstərmə, yoa salma.
Hilal – tazə duan ay.
Hifz – qoruma.
Hirman – məhrum olma.
Hirs – qısqanc, paxıl; istək, həvəs.
Hiyəl – hiylələr.
Hümayun – bəxtiyiar, xoşbəxt.

Hümrət –qızıl, al, qırmızı.
Hürkünçlük – ürkmək, qorxmaq.

**–X–**

Xab – uyğu, yuxu, düş, röya.
Xabalud – xumar.
Xakistər – kül.
Xamə – qələm; usul, tərz; ipək.
Xamun – düz, düzənlik.
Xar – tikan.
Xarbəst – tikanlı hasar.
Xarxar – tikan yeyən (dəvə).
Xas – saman.
Xassə – xas olan; keyfiyyət; padşahın yaxın adamları.
Xavər – gündoğar, şərq.
Xəcil – utanma, xəcalət çəkmə.
Xədəng – ox, peykan.
Xəlq – yaratma, törətmə.
Xəm – əyri.
Xəndan – gülən; açılan.
Xərabat – meyxana, mey içilən yer.
Xərif – ağlı gedən.
Xəşək – çöp, ot, saman.
Xətt – xətt; üz, surət, çöhrə.
Xəzra – yaşıl.
Xilaf – qarşı, qarşı çıxma.
Xələt – xələt, don, ənam, mükafat.
Xirəd – ağıl; düşüncə, fəhm.
Xirədmənd – ağıllı.
Xişt – kərpic, çiy kərpic.
Xunab – qanlı yaş.
Xunbar – qan tökən, qan axıdan.
Xursənd – şad, xoşhal.
Xurşid – gün, günəş; gözəl.
Xürdabin – tələb edən; eyb tutan.
Xürd – yemə-içmə.
Xürdü-xab – yemək və yatmaq.

**–İ–**

İbarə – cümlə, söz, ifadə.
İbrət – dərs, nəticə.
İbtida – başlama.
İfşa – faş etmə, mə’lum etmə.

İrsal – göndərmə.
İfşa – faş ətmə, yayma.
İftitah – açılma; başlama.
İltifat – lütf etmə, lüth göstərmə, yaxşılıq etmə.
İnfial – utanc, utanma.
İnşa – yazma, yaratma.
İrşad – pir, yol göstərən.
İstiğna – naz; saymazlıq.
Istila – tutma, ələ keçirmə.
İstilah – ad, temin.
İştiyaq – güclü şövq; həvəs, arzu, istək.
İna – cəbr, əzab, qəm-qüssə.
İtab – qəzəb; naz etmə; məlamət etmə.
İtnab – çox danışma, söhbəti uzatma.
İzhar – əyan etmə, bəyan etmə.
İztirab – dərd çəkmə.

**–J–**

Jalə – şeh; qırov; yağış.

**–K–**

Kafur – kamfora ağacı və ya yarpağı.
Kah – saman.
Kam – arzu, meyl; məşuq, sevgili; məqsəd, niyyət; şəhvət.
Kamran – hökmrəvan, kam alan, məqsədinə yetən.
Kargər – işçi, fəhlə; təsir edici.
Kəhkəşan – süd yolu, ağ mayanın yolu.
Kəhrüba – inci, kəhrəba.
Kəsrət – çox, çoxluq.
Kirdigar – Allah, xuda, yaradan.
Kişvər – yurd, vətən.
Kövkəb – ulduz.
Kuh – dağ.

**–Q–**

Qal – söz, söhbət.
Qamət – boy, boy-buxun.
Qammaz – göz-qaşla işarət etmə, naz etmə; həyəcana salma; məşuqun gözü.
Qane – varlı, dövlətli, zəngin.
Qarət – talan, yağma.
Qarl/qarrı – qoca, ixtiyar.
Qasid – çapar, xəbərçi.
Qatil – öldürən, öldürücü.

Qəbra – yerin üstü; qum rəngli, quma bulaşan.
Qəbul – layiq, münasib.
Qədd – ölçək, dərəcə; boy, uzun boy; oğlaq və ya quzu dərisi.
Qədəh – kasa, piyalə.
Qəmər – ay.
Qəmpərvərd – həmişə qayğı-qəmdə gəzmə, qəm-qüssəli.
Qəmü ənduh – qəm və qayğı.
Qəni – varlı.
Qərqə – qərq olan, qərq edilən.
Qəsr – köşk, saray, qalaça.
Qəsvət – sərtlik, can sıxıntısı, qəmginlik.
Qətl – öldürmə, ölüm.
Qətrə – damla, damcı.
Qilüqal/qeylüqal – qalmaqal.
Qüds – muqəddəs, əziz.
Qüssəamiz – qüssəli, qəm-qüssəyə batan.

**–L–**

Leylətil-me’rac – merac gecəsi, peyğəmbərin merac edən gecəsi.
Ləbaləb – dopdolu, pürə-pür.
Ləhd – gor, qəbr, aramgah.
Ləhn – avaz, ahəng, həng; nəğmə, muğam, məqam.
Ləhzə – bir an, az vaxt; baxma, baxış.
Lə’l – qiymətli daş, yaqut; dodaq; şərab; qızılı rəng.
Lə’lgün – lə’l kimi.
Ləm’ə – parlaqlıq, şö’lə.
Ləuhsi – hasablanması mümkün olmayan.
Likən – amma.
Lütf – yumşaqlıq, məhrəmlik, əzizlik.

**–M–**

Macəra – vaqeə, hadisə.
Mah – ay.
Malamal – dolu, dopdolu.
Manənd – bənzər, oxşar.
Medad – qələm.
Mehparə – ay parçası.
Mehr – gün; üz, surət, çöhrə.
Mehri – gizlin, pünhan.
Me’rac - yuxarı çıxma; nərdivan; pillə.
Meygün – çaxır kimi qızıl, qızıl mey rəngi.
Məcruh – yaralı; xəstə.
Məhvəş – ay üzlü.

Məhzun – qüssəli, qayğılı.
Mə'dum – yox, yox olan, üzə çıxmayan.
Mə'mur – abad, düzədilən, imarət edilən.
Mə'sum – günahsız.
Məxmur – sərxoş.
Məxzən – xəzinə.
Məqam – məkan, yer, mənzil, məskən; dərəcə, mərtəbə.
Məqdəm – qədəm qoyma, qədəm qoyulan yer.
Məqdur – mümkün qədər, imkan daxilində; alın yazısı.
Məqsud – məqsəd, murad.
Məfhum – açıq, bəlli, fəhm edilən.
Məftun – özünə çəkən.
Məhcur – ayrı düşən, uzağa gedən.
Məhkum – hökm edilən, tabe edilən.
Məhzun – qayğılı, qəmli, qəmgin.
Məknun – gizlin.
Məks – saqınma, saxlanma, əylənmə, durma.
Məlamət – bizar olma, usanma, azar görmə.
Məlayik – fəriştə.
Mə'mur – əmr edilən, vəkil.
Mən' – qadağan, haram.
Mənzur – göz önündə tutma, göz önünə gətirmə, nəzərdə tutma.
Mərdüm – gözün qarası, didə.
Mərəz – xəstəlik.
Mərhun – girov, zamin.
Məriz – xəstə.
Mərqum – yazı, yazılan.
Məsaf – müharibə, döyüş meydanı.
Məsiha (Məsih) – İsa peyğəmbərin ləqəbi.
Məşuf – şadlıq, hədsiz sevinc, dəlicəsinə vurulma.
Mətlə – günəşin və ya başqa ulduzun çıxması; qəzəlin ilk beyti.
Məva – məskən, mənzil, yurd.
Məxfi – gizlin, örtülü.
Məzaəl bəsər – Qur'anın 53-cü surəsinin 17-ci ayəti: «gözü meyl etmədi».
Məzlum – zülm görən, sitəm çəkən.
Mə'zur – üzrlü, günahını bağışlama.
Mina –şüşə; mavi; bəzək; şərab şüşəsi; bir quş adı. Günbəzi- mina – mavi asiman.
Mizan – tərəzi.
Mizraqi-zöhd – tərki-dünyaliq meydanı.

Möhtəşəm – həşmətli, həşəmətli, şöhrətli.
Mötad – adətkərdə.
Mövzun – qədd-qamətli.
Munis – üns verən, alışılan; həmdəm, dost, dost-yar.
Mur –qarışqa.
Muğ – atəşpərəst; gözəl.
Muğbəççə – atəşpərəst övladı; gözəl.
Mu(y) – qıl, saç, zülf.
Muyə – qıl kimi, qıl şəkilli.
Müaf – bağışlanan, günahı keçilən.
Mübah – halal, rüxsət edilən.
Mübariz – batır, güləşçi, savaşçı.
Mücəssəm – heykəl.
Müddəi – iddia edən.
Müdəvvər – dairəvi.
Müfəttin – fitnəçi, fitnə salan.
Müflis – iflas edən; qərib, fəqir, möhtac.
Mühal – mümkin olmayan.
Mühlik – həlak edən, öldürən.
Müğənni – bəxşi, oxuyan; sazəndə.
Müxalif – qarşı çıxan.
Müxtəlif – dürlü, hər cür, qarışıq.
Müqəyyəd – bağlanan; şərtlənən.
Mü’nim – ne’mət verən, cömərd, yaxşılıq edən; varlı.
Müjdə – xoş xəbər, muştuluq.
Müjgan – kirpiklər.
Münqəte’ – kəsilən, üzülən.
Münsərif – inkar etmə, fikrini dəyişmə.
Müntəzir –gözləyən.
Mürr – ağır (xəstə), acı, kədərli, qəmli.
Müshaf – kitab; Allah-təala tərəfindən endirilən kitab; Qurhan.
Müsəhhər – yiyələnmə, basıb alma; tabe olma.
Müsəvvər – şəkl, surət çəkən.
Müstəcil – tələsən.
Müstəmənd – möhtac; qüssəli.
Müstəqim – doğru, birbaşa.
Müşfiq – mehriban, şəfqətli.
Müşəvvəş – bulaşan, qarma-qarıışıq.
Müşki-nab – arəstə müşk.
Mütakif – ibadət edən.
Mürəttəb – tərtibli, düzgün.

Mütərib – iqrar edən, boynuna alan.
Müttəsil – həmişə, daim, fasiləsiz.
Müvəccəh – dərəcəli, dərəcə sahibi; layiq, münasib.
Müzəffər – qalib, zəfər qazanan.
Müzəyyən – bəzəkli, bəzəldilmiş.
Müzir – ziyan verici, ziyankar, zərərli.

**–N–**

Nab – arəstə, duru, saf.
Nahan/nihan – gizlin, örtülü.
Naməfhum – dərk edilməyən.
Namövcud – olmayan.
Narı – kənara, an(a)rı, qarşı tərəfə.
Naseh – nəsihətçi.
Naşəkiba – səbrsiz, bisəbr, taqətsiz.
Natəvan – gücsüz, aciz.
Navək – ox, peykan; kirpik.
Nazil – aşağı enmə.
Nəbat – bitki.
Nəhr – dərya; çay.
Nəxl – xurma ağacı, ağac.
Nəməkdan – duz qabı.
Nəmudar – görkəzmə, aşikar etmə.
Nəş – cəsəd, meyid.
Nəşimən – oturan, qonan, oturma, qonma.
Nəva – həng, ahəng, mahnı, nəğmə; muğam; nalə, ağı.
Nəzzarə – baxma, seyr etmə.
Nilgün – mavi rəngli, mavi.
Nisar – qurban, fəda, bağışlama, saçma, səpmə.
Niş – iti uclu şey, iynə, nizə, diş.
Nişəst – oturma, şökmə.
Növhə – ağı, ah-nalə.
Növhəgər – ağı deyən, ağlayan.
Növrəs – təzə, yeni yetişən.
Nuşxənd – gülmə.
Nücum – ulduz; astronomiya.
Nüman – qızıl; qan rəngi. Laleyi-nüman – qızılgül.
Nüktə – fürsət; mənalı söz.
Nüq – bir şeyin ucu, uc.

**–Ö–**

Övraq – vərəqlər, səhifələr, yarpaqlar.
Övrat – virdlər, dualar, diləklər.

Örtəmək – yanmaq, tutşmaq.

**–P–**

Pakbaz – qumarbaz; məşuquna pak nəzərlə baxan aşiq; təqva sahibi, tərki-dünya.
Parsa – ibadətçi, dindar, tərki-dünya sufi.
Payan – son, axır, sərhəd.
Paybənd – ayağı bağlı, cidarlı.
Paybəst – ayağı bağlı.
Peyapey – ard-arda.
Peyğam – xəbər.
Peyk – xəbərçi, çapar, qasid; salam, salam məktubu.
Peykan – nizə; ucu dəmirli ox.
Peykər – vuruş, cədəl.
Peyma – saqi.
Peyvəstə – bitişik, bağlı.
Pədidar – əyan, bəlli, görünən.
Pərçəm – saç, zülf; bayraq, tuğ, sancaq.
Pərirux – pəri üzlü.
Pərişan – dağınıq.
Pərkalə – parça-parça.
Pərkənt – məcalsız, halsız, taqətsiz.
Pərtöv – nur, işıq.
Pərvanə – kəpənək.
Pərvər – tərbiyə edən; sevən.
Pəs – ondan sonra.
Piç – hörük, hörülmüş saç.
Piçan – hörülən, tovlanan.
Piçü tab – burulub tovlanmaq.
Piçü xəm – büklülən və əyilən, tovlanan və əyilən.
Pirəhən – köynək.
Pişən – alın.
Püştə – təpə, hündürlük; yük; dəstə.

**–R–**

Rah – şadlıq; şərab, mey; muğam.
Ram – əldə edilən, tabe etmə.
Raz – sirr.
Rədü bərq – ildırım və göy gurultusu.
Rəfiq – yoldaş, dost, məhrəm, yaran; Allahın sifətlərindən biri.
Rəftar – hərəkət, usul, özünü aparma.
Rə'na – bəzək-düzəkli qadın; təkəbbürlü qadın; gözəl, özünə çəkən.
Rəqəm – yazı.

Rəqim – yazıçı, yazan.
Rəq – qan damarı, damar.
Rəhn – girov.
Rəm – qorxma, ürkmə.
Rəmz – işarət, anlatma, işarət etmə.
Rəgnamiz – naxışçı, nəqqaş.
Rənci-hicran – ayrılıq dərdi.
Rəxşən/rəxşan – parlaq, şö'lə saçan.
Rəsm – qayda, adət; ayin.
Rəstixiz – qiyamət.
Rəşk – paxıllıq; üstün olma, qalib gəlmə; qeyrət.
Rəvan – axan, hərəkət edən; ruh.
Rind – məkrli, hiyləgər, çəkinməyən, laübali.
Riş – yara; saqqal.
Riştə – damar; ip; bağlanan.
Riv – məkr, hiylə, aldatma.
Riyah – yellər; iy, qoxu.
Riyazət – tərki-dünyalik.
Riz-riz – ovuncak-ovuncak.
Rövzə – bağ, bostan.
Rubəru – üzbəüz.
Ruhəfza – canlandırıcı, ruhlandırıcı, coşdurucu.
Ruhpərvər – ruhu kamala gətirən, ruhlandırıcı.
Ruhil-qüds – Cəbrayıl; müqəddəs ruh.
Ruzəfzun – çox artıq, çox gözəl, çox nurlu.
Ruzigar – həyat; əyyam, zəmanə, dövr.
Rüfu – yırtığı ustalıqla tikmək.
Rüxsar – üz, yanaq, çöhrə.
Rüqə – namə, xətt, yazı.

**–S–**

Salah – yaxşılıq, abadlıq; saf ürəklilik, arəstəlik, paklıq; məsləhət.
Sane' – yaradıcı, törədici; Allah-təala, tanrı; sənətkar.
Sarsar – sərt və soyuq yel.
Seylab – sel-su, sel; göz yaşı.
Səadət – bəxt, bəxtiyarlıq; mübarək; üstünlük.
Səba – dan yeli.
Səccadə – namazlıq xalçası.
Səfhə – səhifə, vərəq; tərəf, bir şeyin üzü; üz, sifət, çöhrə.
Sə'b –müşkül, ağır, çətin.
Sə'd – bəxt.
Səhab – bulud, duman, sis, çən.

Səhba – qızıl; şərab, mey.
Sə'y – çalışma, hərəkət etmə, can atma.
Səyd – ov, şikar.
Səyyad – ovçu.
Səbzə – göy, göyərti; üzdə yeni çıxan tüklər.
Səhhət – sağlıq, sağlamlıq.
Səktə – özündən gitmə.
Səlasil – zəncir, sap, qatar.
Səmənbər – yasəmən ətri; əndamı yasəmən ətri verən.
Səmənd – dür at.
Səmər – hasil, meyvə, nəticə.
Səmum – isti külək.
Səngibaran – daşqalaq etmə.
Sər – baş, kəllə; fikir, əndişə; güc, qüvvət; sərkərdə, sərdar.
Sərasər – başdan-başa, başdan-ayağa.
Sərbəsər – boydan-boya, başdan-başa.
Sərfitnə – fitnənin başı, fitnəkar.
Sər riştə – ipin ucu; bir işin üsulu.
Sərgəştə – başı hərlənən; evsiz-eşiksiz, sərgərdan, avara.
Sərmənzil – mənzil, düşərgə, məkan.
Sərnəvəşt – iqbal, tale, yazı.
Sərzəniş – şikayət.
Sərkəş – boyun əyməzlik.
Səqf – tavan, səqf.
Sətiz – vuruş, dava, cəng.
Səvad – savad, elm; qara, qara rəng.
Səvat – şəhər ətrafı; böyük şəhər.
Səza – muzd, haqq; layiq olan; yaraşan; cəza.
Sıxarıb – sıxıb, son damlaya qədər sıxıb.
Sifal – kuzə, kasa; kaşı.
Simab – civə.
Siminbər – gümüş tən.
Sipah – qoşun.
Sipehr – asiman; fələk, ərş; bəxt, iqbal.
Sirab – sudan qanan, doyan; sulu; tər, təzə.
Sirri-nihan – gizlin sirr.
Sirişk – göz yaşı, qığılcım; yandırılan vaxt yaş odundan çıxn su.
Sud – xeyir, fayda.
Suft – deşik, deşilən; iynənin gözü.
Sur – şadlıq, sevinc; üz, surət.
Suzan – yanan, qızaran, dağlanan. Suzi-güdaz – nalə çəkmə; əzab

çəkmə.
Sünbül – bitki, güllü bitki, xoş ətirli; bığ yerinin tərləməsi; gözəllərin zülfü.
Süqubət – düşmənlik, kin bəsləmə.
Sürəyya – ulduz.

**–Ş–**

Şam – gecə, axşam.
Şamil – ibarət olan, öz içinə alan, əhatə edən.
Şəfiq– şəfaət edən; mehriban, yürəyi yanan, rəhmi gələn.
Şəbgərd – gecə gəzən, axşam seyrə çıxan.
Şəbistan – hücrə; hərəmhana; camilərdə gecələr ibadət edilən yer.
Şəbnəm – şeh, jalə, qırov.
Şəbxun – gecə basqını.
Şədd – mökəm etmə, bərkitmə; gücləndirmə.
Şəkərxənd – təbəssüm.
Şəqaf – ürək pərdəsi.
Şəmmə – xoş iy, xoş ətir; az, az-kəm, azacıq.
Şənrəf – qızıl, yaxud qonur rənq, nəqqaşların işlətdikləri maddə.
Şərabalud – şərabçı.
Şərər – od, qığılcım.
Şər' – şəriət; usul, yol; din, məzhəb.
Şərh – bəyan etmə, əyan etmə, düşündürmə, açıqlama, izah etmə.
Şərməndə – utancaq, xəcil.
Şətta – müxtəlif şeylərdən ibarət, cürbəcür.
Şikvə – şikayət; nalə, fəğan, ah-nalə.
Şitab – tələsmə.
Şivən – ah-nalə, ağı, fəryad.
Şuriş – qarışıqlıq, çaxnaşma.

**–T–**

Tab – şö'lə, nur; istilik; qızdırma.
Tarac – talan.
Tarım – çadır, ev; asiman, fələk.
Teyr – quş.
Təğyir – dəyişmə, başqa şəklə girmə.
Təhəmmül – səbr, dözüm.
Təhrir – yazma.
Təhsin – bərəkəlla, tərif.
Təqrir – bəyan, bəyan etmə, təsdiqləmə.
Təlx – acı.
Tənəüm – naz-ne'mətlə yaşama, şadlıq, rahatlıq, arxayın yaşama.
Tənnaz – nazlı; utandıran; dəyişkən.

Tərb – nəğmə, mahnı, saz.
Tərx – düzmə, biçmə.
Təriq – yol, üsul.
Təsxir – boyun əydirmə, ələ keçirmə, basıb almaqlıq, tabe etmə.
Təbarək – pak, pakizə, saf, arəstə.
Təcəlli – bəzək, şö'lə; üzə çıxma, görünmə.
Təhərrük – hərəkət.
Təkəllüm – söz, sözləmə, danışma.
Təmənna – arzu, istək, niyyət.
Tərdamən – ətəyi yaş olan; pozuq; günakar, asi.
Tərəhhum – rəhm etmə.
Tərənnüm – vəsf etmə.
Tərrar – cibgir, oğru.
Tərsa – xristian.
Təşbih – bənzər, kimi, misli; bənzətmə.
Təvəhhüm – qorxu, xof, vəhm etmə.
Təzvir – yalan, hiylə, aldatma; ikiüzlülük.
Tifl – çağa, uşaq.
Tirə – qaranlıq; bulaşıq; qüssəli.
Tö'mə – yemək, nahar.
Tudə – yığıntı; təpə; böyük.
Tümən – on min. Tümən min – milyon.
Tündbadi – güclü yel.
Tün-gün – gecə-gündiz.
Türrə – zülf, saç, hörük.

**–U–Ü–**

Uçqun – qığılcım, şölə, alov.
Uyalmaq – xəcalət çəkmək.
Uyat – xəcalət, utanc.
Üqubət – əzab, sitəm.
Ümdə – əsas, mühüm; inamlı.
Ümmül-kitab – əsl kitap, lövhi-məhfuz – talelər kitabı.
Üryan – çılpaq, paltarsız, libassız.
Üstüvar – bərk, möhkəm.
Üşşaq – aşiqlar, sevənlər, eşqə düşənlər; muğam adı.
Üzar – üz, yanaq.

**–V–**

Vaiz – vəz verən, möizə oxuyan; nəsihətçi.
Vallahu əlam bis-səvab – doğrusunu Allah bilir.
Vaqeən – həqiqətən.
Vaqif – xəbərdar, agah olan.

Vaveyla – vay, həsrət.
Vəch – üz, xarici tərəf, tərəf, şəkil.
Vəl-leyl – Quranın 92-ci surəsinin 1-ci ayəti; «Gecəyə and olsun».
Vəş-şəms – Quranın 91-ci surəsinin 1-ci ayəti; «Günəşə and olsun».
Vəz-züha – Quranın 93-cü surəsinin adı; «Səhərə and olsun».
Vida – xudahafizləşmə.
Vird/vərd – dua, dua-dilək.
Vüquf – xəbərdar olma, baxəbər olma.

**–Y–**

Yağma – talan, oğurlama.
Yaqutgun – yaqut kimi, yaqutvari.
Yaruq – parlaq, işıqlı.
Yarutma – işıqlandırma.
Yavutmaq – yaxınlaşdırma.
Yelda – ən uzun gecə.

**–Z–**

Zail – yox olma, batma, itmə.
Zə'f – gücsüzlük, xəstəlik, acizlik.
Zəngar – yaşıl rəngli.
Zərbaf – tikişçi; zərlə toxuyan.
Zərd – sarı.
Zəval – itmə, yox olma; günorta vaxtı; nöqsan; xərabə, viran; bəla, bədbəxtlik.
Zəxm – yara.
Zib – bəzək.
Zimn – içi, arası, ortası; açıqdan söylənməyən, ancaq anlaşılan söz.
Zinhar – agah ol; özünü qoru; aman.
Ziya – şö'lə, nur, parlaqlıq, rövşən.
Zöhd – təqvalıq, tərki-dünyalik, dindarlıq.
Zühur – üzə çıxma, aşkar olma.
Zülmət – qaranqılıq.
Zümrə – dəstə, qisim.
Zünnar – qurşaq.

**R a m i z ƏSKƏR**



10 yanvar 1954-cü ildə Amasiya rayonunun Qaraçanta kəndində müəllim ailəsində doğulmuşdur. M.V.Lomonosov adına Moskva Dövlət Universitetinin jurnalistika fakültəsini bitirmişdir (1978).

Azərbaycan radiosunda redaktor (1978-83), Azərbaycan, türk, ərəb, fars, ingilis, fransız və alman dillərində çıxan «Azərbaycan bugün» jurnalının baş redaktoru (1983–84), kiril, latın və ərəb əlifbaları ilə nəşr olunan «Odlar yurdu» qəzetinin baş redaktoru (1984-91), «Hürriyet» qəzetinin (İstanbul) Azərbaycan üzrə xüsusi müxbiri (1991-93), Xarici Turizm Şurasının idarə rəisi (1993-94), «XXI əsr» qəzetinin baş redaktoru (1994–96), «Yeni Forum» jurnalının (Ankara) Bakı təmsilçisi (1993-97) olmuşdur. 1997-ci ildən Azərbaycan Jurnalistlər Birliyinin baş katibidir. Bakı Dövlət Universitətinin bədii tərcümə elmi-tədqiqat laboratoriyasının müdiri, AMEA Folklor İnstitutunun baş elmi işçisidir. Filologiya elmləri doktorudur.

«Qızıl qələm», «Həsən bəy Zərdabi», «Humay», Küveytin «İslama xidmət», Türkiyənin «Yeni Orhun» və «Türk dünyasına xidmət», Türkmənistanın “Altın əsr” mükafatları laureatıdır. Azərbaycan Yazıçılar və Jurnalistlər Birliklərinin, Beynəlxalq Mətbuat İnstitutunun (İPİ, Vyana) üzvü, Beynəlxalq Jurnalistlər Birlikləri Konfederasiyası (Moskva) və Avrasiya Jurnalistlər Konfederasiyası (Ankara) idarə heyətlərinin üzvüdür. Azərbaycanın əməkdar jurnalistidir. Türkologiya, ədəbiyyat, tarix və jurnalistikaya dair kitablar yazmış, türk, rus, özbək, uyğur, türkmən, qaqauz dillərindən tərcümələr etmişdir. Avrasiya Tərcüməçilər Birliyinin (Ankara) sədri seçilmişdir (2010).

Əsas əsərləri:

1. İqlimdən-iqlimə, təqvimdən-təqvimə. Bakı, İşıq, 1987, 104 s.
2. Qutadğu bilig. Bakı, Əlm, 2003, 320 s.
3. 80 yaşın zirvəsindən baxanda. Bakı, Adiloğlu,2005,356 s
4. Mahmud Kaşğari və onun «Divanü lüğat-it-türk» əsəri. Bakı, MBM, 2008, 432 s.
5. Mahmud Kaşğarinin 1000 illik yubileyinə 1000 biblioqrafik göstərici. Bakı, MBM, 2008, 96 s.
6. Mahmud Kaşğarinin «Divanü lüğati-it-türk əsəri üzrə biblioqrafik və qrammatik göstərici. Bakı, MBM,2008,192 s.

7. Mahmud Kaşğari və onun «Divanü lüğat-it-türk» əsəri. Bakı, MBM, 2009, 532 s.

8. Mahmud Kaşğarinin «Divanü lüğat-it-türk» əsərinin tədrisi. Bakı, MBM, 2011, 112 s.

Əsas tərcümələri:

1. Azərbaycan Masalları. Bakı, Yazıçı, 1982, 196 s.
2. M.B.Məmmədzadə. Milli Azərbaycan hərəkatı. Bakı, Nicat, 1991, 248 s.
3. Faruq Sümər. Oğuzlar. Bakı, Yazıçı, 1992, 432 s.
4. Yusif Balasağunlu. Qutadğu bilig. Bakı, Azərnəşr, 1994, 492 s.
5. Murad Tağı. Həyatım. Bakı, Oxa Ofsət, 1998, 92 s.
6. Erik Fichtelius. Jurnalistikanın on qızıl qaydası. Bakı, AJB, 2002, 192 s.
7. Bahəddin Ögəl. Türk mifologiyasi. Bakı, Səda, 2004, I cild, 626 s.
8. Mahmud Kaşğari. Divanü lüğat-it-türk. Bakı, Ozan, 2006, I cild, 512 s.
9. Mahmud Kaşğari. Divanü lüğat-it-türk. Bakı, Ozan, 2006, II cild, 400 s.
10. Mahmud Kaşğari. Divanü lüğat-it-türk. Bakı, Ozan, 2006, III cild, 400 s.
11. Mahmud Kaşğari. Divanü lüğat-it-türk. Bakı, Ozan, 2006, IV cild, 752 s.
12. N.Ozerov. İlham Əliyev: Mən Azərbaycanıma inanıram. Bakı, Azərnəşr, 2007, 376 s.
13. Махмуд Кашгарский. Дивану лугат ит-тюрк. Баку, МБМ, 2009, I том, 512 с.
14. Махмуд Кашгарский. Дивану лугат ит-тюрк. Баку, МБМ, 2009, II том, 400 с.
15. Махмуд Кашгарский. Дивану лугат ит-тюрк. Баку, МБМ, 2009, III том, 492 с.
16. Oraz Yağmur. Qarabağlı ananın ağısı. Bakı, MBM,2009, 84 s.
17. XX əsr özbək şeiri antologiyası. Bakı, MBM, 2009, 96 s.
18. Molla Nəfəs. Bu məkana gəlmişəm. Bakı, MBM, 2010, 160 s.
19. Molla Nəfəs. Seçilmiş əsərləri. Bakı, MBM, 2010, 240 s.
20. Todur Zanet. Ana dilim. Bakı, MBM, 2010, 104 s.
21. Məxdumqulu Fəraqi. Seçilmiş əsərləri. Ankara, 2010, 448 s.
22. Türk ədəbiyyati tarixi. Bakı, MBM, 2010, I cild, 602 s.
23. Türk ədəbiyyati tarixi. Bakı, MBM, 2010, II cild, 658 s.
24. Nurməhəmməd Əndəlib. Şeirlər, poemalar, dastanlar. Bakı, MBM, 2011, 292 s.
25. Zəhirəddin Məhəmməd Babur. Seçilmiş əsərləri. Bakı, MBM, 2011, 328 s.

Türkcə, rusca, almanca və ermənicə bilir.

E-mail: ramizasker@yahoo.com

# İÇİNDƏKİLƏR:



**TürkSOY kitabxanası seriyası: 9**

AMEA Folklor İnstitutu Elmi Şurasının qərarı ilə çap olunur

Azərbaycancaya uyğunlaşdıran
və ön sözün müəllifi:
**Ramiz ƏSKƏR**

Redaktoru:
**Prof. Dr. Rafael HÜSEYNOV**

Sponsoru**:**
**Dr. Ayla ƏSKƏR (İzmir, Türkiyə)**

Naşiri:
**Dos. Dr. Rafiq BABAYEV**

**Sultan Hüseyn Bayqara. Divan. Bakı, MBM, 2011, 248 s.**

Korrektor: Leyla
Texniki redaktor: Ülvi Arif
Kompüterdə yığdı: Solmaz Əskərova
Dizayner: Ceyhun Əliyev

---

Çapa imzalandı: 22.12.2010
Formatı: 84x68
Həcmi: 15,5 çap vərəqi
Tirajı: 1.000 ədəd
MBM MMC mətbəəsində
çap olundu.